*28 məhərrəm 1330* **Yeddinci il** 6 января 1912 г.

# ملانصرالدین

**№1 Qiymәti 12 qәpik.**

# МОЛЛА НАСРЕДДИНЪ

**Цена 12 k. № 1**



Litoq. S.Bixova.

*Qoymanam qәzet alıb oxuyasan: lamәzhәb olarsan.* \Vladiqafqazda\

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində: 12 ay--altı manat.
6 ay..........................................3 manat yarım.
3 ay..........................................2 manat.
Kasıblara..................................12 ay--5 manat.
6 ay.......................................... 3 manat.
3 ay..........................................1manat 60 qəpik.
1 ay..........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay........................................7 manat.
6 ay..........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə.........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*28 məhərrəm 1330* *hər həftə nəşr olunur* *6 yanvar,1912*

Xaçpərəstlərin təzə il və xaç bayramları məcmuəmizin iki gün təxirə düşməyinə səbəb oldu. Bundan sonra həftədə bir dəfə, şənbə günləri məcmuəmizin tərtib ilə çıxmağına əhd edirik, keçənlərdə də bizdən asılmayan səbəblərə görə məcmuəmizin yubanmağını yada salıb oxuculardan üzr istəyirik.

***"Molla Nəsrəddin" idarəsi***

## TƏZƏ İL

Bir il keçir, o biri il gəlir, 1329-cu il keçdi, 1330-cu il daxil oldu. Xaçpərəstlərin 1911-ci ili getdi, 1912-ci ili başlandı, aylar dolanır, həftələr, günlər, saatlar, dəqiqələr hərəkət eləyir.

*"Əbrü badü məhü xorşidü fələk dərkarənd,*
*Ta to nani bəkəf ari və bəqəflət nəxori".*

Yəni, bazardan yarım girvənkə çörək alıb yarısını dürmək tut və bismillah de qoy ağzına, yarısını bas qoltuğuna, hər tanışa rast gəlsən, de bismillah, tanışın çörəkdən bir tikə kəsib aparacaq ağzına tərəf və qabaqca bismillah deyib ədəblə çörəyi yavaşca qoyacaq ağzına.

Bu müqəddimədə mən onu istəyirəm deyəm ki, yuxarıdakı Allah həmişə biz müsəlmanların yanındadır, yuxarıdakı Allah həmişə bizim azımızdadır, cibimizdədir, dükanımızdadır, o qədər məscidimizdə deyil ki, evimizdədir.

"Sən Allah Kəblə Həsən gedirsən tez Cəfərə de ki, Allah xatirinə o əmanəti göndərsin", baş üstə deyərəm, Allah qoysa, yarım saata göndərərəm gələr. "Sən Allah, yadından çıxmasın, vallah doğru deyirəm"...

- Hacı, buyur gedək bizə, yaxşıca abgüştümüz var, sən allah sözümü yerə salma. Vallah ac deyiliz. Sən Allah, tez gəl. Baş üstə, Allah qoysa gələrəm, xudanakərdə gəlməsəm, sənə xəbər göndərərəm. Allah tərəfi oldu ki, Həsənəli rastıma çıxdı. Xudavəndi aləm öz nəzərini bəndələrinin üstündən əskik eləməsin, pərvərdigara, sən özün bizim dadımıza yet...

- Məşədi, sən öləsən, and olsun o Allaha ki, səni bazar içində biabır eliyəcəyəm, Allah haqqı zarafat eləmirəm. A yekə kişi, utanmırsan Allahın səkkiz yaşında tfilinə elə biabır-biabır sözlər deyirsən. Allahdan qorx, Allahdan qorx...

- Kəblə İbrahim əmi oğlu, and olsun bizi yaradan bir Allaha ki, ona tay yoxdu, mən sizin uşağa güldən ağır söz deməmişəm, ancaq vallah-billah, dünən gördüm hamamdan çıxır, dedim bala, bir də hamama gedəndə mənə de, bir yerdə gedək. Vallah bundan savayı bir söz deməmişəm, and olsun Allaha deməmişəm.

"Ta to nani bəkəf ari və beqəflət nəxori", yəni əlinə çörəyi götürəndə əvvəl Allahı yada sal, sonra qoy ağzına, Sədinin sözünə necə ki, lazımdır əməl eyləyirik: bismillah, xeyr, çörək yemişəm. Ya Allah, keç yuxarı başa, ya Allah, ya Allah, buyur, buyur, çörək doğra, ədə duz gətir, ya Allah, ya Allah, çörək doğra, ya Allah, Hacı bismillah, yaxşı otur. Ya Allah, bismillah, maşallah, çox yaxşı bişib pəh, pəh, pəh, çox ləzzətlidir. Bismillah, bismillah, bismillah de, bərəkətli olsun, qonağın payını Allah özü qeybdən göndərir, yarım girvənkə bir çetver qoyun ətidir. Hər kəsin qismətini Allah qeybdən göndərməsə, səkkiz qonaq və dörd nəfər ev sahibi necə tox ola bilər? Ya Allah, Hacı Əli Ələsgər sən də buyur. Mən ölüm, gir içəri, ya Allah, ya Allah.

***Keçək mətləbə.***

*Təzə il gəldi, köhnə il getdi və neçə-neçə təzə illər gəlib gedəcək, aylar dolanacaq, amma sən də çalış ki, çörəyi qəflətdə yemə, çünki indi Sədi əsri deyil. Boş-boş Allahı çağırmaqla Allah işlərini ötürüb göydən yerə pilləkan qoyub, yenib gəlib sənə kömək eləməz.*

*Lazımdır çalışmaq, çalışmaq, çalışmaq.*

*Uşağını qoy dərsə: dilləri oxusun. Elmlərdən, fənlərdən xəbərdar olsun, sənət, ticarət öyrənsin, hər kəs nəyə şövq eləsə.*

*Allahın da öz yeri var: ibadət zamanı Allahı yada salmaq öz qaydası ilə, yoxsa arxayın yatma ki, Allahı çağıran kimi gəlib sənin ciblərini qızıl ilə doldurub gedəcək.*

*Bozbaşdan doymaq istəyirsənsə, qonaqlarını tox yola salmaq istəyirsənsə, çömçəyə çox ət sal. Yoxsa bismillah deməklə insanlar tox olsalar, dəxi dünyada aclıq olmaz.*

*Təzə il gəldi, amma biz deyəsən elə haman durduğumuz yerdə qaçırıq qabağa:*

*Rus saldatlarının bir məşqi var: divarın dalından qulaq asanda elə bilirsən ki, qoşun gəlir: tap, tap, tap, tap, amma gözləyirsən görürsən ki, qoşun bir yana çıxmır, tappıltı yenə gəlir, axırda məlum olur ki, bu da bir cür məşqdir ki, saldatlar durduqları yerdə qaçırlar.*

*Deyəsən biz də durduğumuz yerdə qaçmaqdayıq*

*«Molla Nəsrəddin»*

## VƏDƏ

Vədə bizə behişti genə rövzəxan verir
Köhnə ölülərə yenidən bir də can verir.

Əvvəl özü süud eləyir ərşi-minbərə
Cənnətlər içrə sonra bizə o məkan verir.

Hurilər ilə eyləyir o, qol-boyun bizi
Bir kərbəlayıya iki yüz nazlı can verir.

Nazik don içrə ağ bədəni cilvələndirir
Ağ üstüxan içində ilikdən nişan verir.

Hacıları behiştə sürür o sürü-sürü
Mollaları bu kəlleyi-gavə çoban verir.

Bir möminə behiştdə yüz min şəhər satır
Hər şəhr içində binlər ilə qunc atan verir

Fikrincə rövzəxanın oyunxanədir behişt
Hər bambılı və bitliyə orda məkan verir.

Hər burnu firtıxlını cənnətlik eyləyir
Hər oğruya, adamcıla izzət və şan verir.

Beş şahıya salır içəri yolkəsənləri
Pul verməyənlərə necə föhşü yaman verir.

Hər nə olursan ol, iki pul ver müsürman ol
Kafir də olsa qəbzi-behişti nihan verir.

Əlhasil arizuya yetişmək degil çətin
Qırx gün məhərrəmi diləsən hər zaman verir.

*Keysiz*

## AD

*(Keçən nömrədə jurnalımızda çap etdiyimiz Petrovskinin məktubuna cavab)*

Dünyada necə insanları xudayi-təala cürbəcür yaradıb, belə ki iki adam tapa bilməzsən ki, bir birinə oxşasın, habelə əqidələr də müxtəlifdir, məsləklər də cürbəcürdür, xasiyyətlər və məzaqlar da növbənövdür. Ola bilər ki, bir şeyi sən artıq dərəcədə xoşluyarsan, qeyriləri onu bəyənməyə və əksinə də olur.

Həmçinin ad məsələsində Məhəmmədəli kimi gözəl adı xoşlamırsan, o səbəbə ki, İranın qabaqkı şahı Məhəmmədəlini də xoşlamırsan.

Təvəqqe edirəm ki, məndən rəncidəxatir olmuyasan. Amma mən elə qanıram ki, bu bir əfsanədir ki, söyləyirsən, necə ki, bəzi yazıçılarımız öz cızıqlarından çıxıb Sultan Həmid adı çəkirlər. Bunu bilirsiniz ki, padşah və sultan sözü danışmaq müsəlman yazıçısına yaraşmaz, biz Firdovsi və Sədilərin əsərləri təhtində pərvəriş tapan millətin balalarının balasıyıq, bizə xaqanların ayaqlarının tozunu silmək yaraşar, amma Məhəmmədəlini bəyənməmək yaraşmaz. İnsan öz təklifini başa düşməlidir, çox da ki, Məhəmmədəli Mirzə tək bir sənin xoşuna gəlmir, amma İranın yarısından çoxu arzu edir ki, yenə Məhəmmədəli Mirzə gəlib çıxsın taxta və mən qandığıma görə iranlıların Məhəmmədəliyə olan məhəbbətlərinin hikməti budur ki, Məhəmmədəli Mirzə çox qeyrətlidir, insafən çox qeyrətlidir, çox qeyrətli, çox namusludur.

İndi gələk Molla Kərimə: yazırsan ki, filan şəhərdə bir nəfər Molla Kərim hökumətə danos verib ki, qazi və iki nəfər molla ittihadi-müslimin sözü danışırdılar və bu səbəbə oğluna Kərim adı qoymaq istəmirsən. Əzizim, buna heç sözüm yoxdur, hər halda bir-birimizdən hökumətə xəlvətcə ərizə verib öz əlimiz ilə öz müsəlman qardaşımızı dərd-sərə salmaq əskik işdir. Amma o qadan mənə gəlsin. Bircə mənə de görüm Nəcəf müctəhidlərindən başlamış Danabaş kəndinə kimi elə bir şəhər varmı ki, orada bizim mollalarımız bir-birini istəsinlər, bir-biri ilə yola getsinlər, bir-birindən hökumətə danos verməsinlər. Sən hələ xırdamırda Molla Kərimləri deyirsən. Tiflisdə böyük ruhani üzvlərimiz içində danos məsələsi o qədər tərəqqi eyləyib ki, bir mollanın evində dolma bişəndə hökumətə həman gecə xəbər çatır ki, bu dolma, kələm dolması imiş, ya badımcan dolması?




*Sərab kəndində məktəb daşlarını aparıb özlərinə ev tikirlər.*
*Участь школьного строительного матерьяала*

*(Серабь Елисав. губ)*

Əzizim, yazdığın məktubun bəzi nöqtələrinə sözüm yox, qardaşına zəhər verən Xançobanlı Heydər bəyə lənət, amma Sadığı mənim qanacağımca, nahaq pisləyirsən: yazırsan Kərbəlayı Sadıq qumarbazdır, doğrudur, qumar oynamaq pis məşğələdir, amma gərək bu günahı da bağışlayasan kişinin kərbəlayılığına, axır zəhmət çəkib, baha olan vaxtını sərf eləyib kərbəlayı adı qazanıb, insafdırmı ki, bunu nəzərə almayasan.

Bir də elə bilmə ki, bir adın sahibi ki, sənə xoş gəlmir dəxi dünyada o adda yaxşı adam yoxdur. Məsələn: Rəhimin quldurluğu səni bu addan qaçırdır, amma Hacı Rəhimə nə sözün? Keçəl Əkbəri bəyənmirsən, amma şaxsey dəstəsində dəstəbaşı idi. Kor Məcidi xoşlamırsan, amma vallah, billah o kişi məndən də, səndən də mömindi. Qotur Səfdəri xoşlamırsan, o yazıq ömründə bircə dəfə də naməhrəm üzünə baxmayıb. Babi Həbibə sözüm yox, amma çopur Qasım Allah bəndəsidir, çolax Eyvaz əzançıdır, cindar Vəli mücavirdir. Urus Əhmədə sözüm yox, amma Hümmət uzunobalı Hacı Hümmətin adıdır ki, ömründə nə qədər varı var, mərsiyəxanlara və duayazanlara paylayıb ki, uşağı olsun.

Bu müxtəsər cavabıma kifayət etməyinizi rica edirəm. Bunu lazımdır nəzərdə tutmalı ki, bari təala dünyanın xilqətində mizanı düz tutub, işığın müqabili qaranlıq və pisliyin bərabəri yaxşılıq olan kimi bir naməqbul hərəkət sahibinin əvəzində dünyada bəlkə neçə-neçə xoş əməl sahibləri var ki, onların duayi-xeyirlərinin kölgəsində biz günahkar bəndələrə bəlkə bir ümid yolu ola.

Yoxsa bu qəflət yolunu ki tutub getməkdəyik, kim bilsin bizi hara aparıb çıxarda bilərdi.

Pənah genə bir Allahadır.

*«Lağlağı»*

## FELYETON

*Mirzə Fətəli Axundovun oğlu mərhum Rəşid bəy keçən vaxtlarda uca olan atasının əlyazılarından bir neçəsini vermişdi ki, oxuyub lazım olan vaxt nəşr edim. O kağızların biri də həmin aşağıda dərc olunan fars dilində yazılmış bir məqalə idi ki, mən onu mirzayi-mərhumun əsəri zənn edib indi türk dilinə tərcümə elədim, göndərdim "Molla Nəsrəddin" idarəsinə. Çünki Mollanın səhifələrində çap olunmağını münasib görürəm.*

*F. Köçərli*

Narodni sovetnik cənab Ağabəy Yadigarov ərəb, fars və türk əlifbasının dəyişdirilməyi barəsində öz xəyalatını yazıb mənə vermişdi ki, oxuyub öz təsəvvüratımı ona ərz edim. Ona binaən mən də bir gün haman məcmuənin mütaliəsinə məşğul idim. İttifaqən bu əsnadə İran əhli Sərab tüccarlarından bir nəfər tanışım yanıma gəldi. Məcmuəni görüb bir neçə sətir ondan oxuyub başını yırğaladı və məndən soruşdu ki, bu nə yazıbdır. Mən ərz elədim ki, bunu yazanın xahişi budur ki, biz - yəni əhli-islam qədimi əlifbamızı dəyişdirib təzə bir əlifba tərtib edək və yazılarımızı onun vasitəsilə yazaq. İran taciri dedi: nə üçün biz əlifbamızı gərək təğyir edək, məgər bizim əlifbanın bir qüsuru var — Dedim bəli, bizim əlifbanın qüsuru aşkardır: bir surətdə ki, kəlməni bir sayaq üzrə oxumaq mümkün deyil, o kəlməni dürüst oxumaqdan ötrü gərəkdir əvvəlcə mənanı bilmək - əlbəttə belə əlifbanın qüsuru çoxdur. Qərəz, hər nəhvi ki mümkün idi, əlifbamızın nəqs və eybini ona təqrir etdim.

İranlı rəfiqim soruşdu: Yadigarovdan qeyri özgələri də bu mətləbi fəhm ediblər, ya nə? Dedim bəli! Neçə il bundan əvvəl cənab Mirzə Fətəli bəy Axundov əlifbamızın təğyiri babində gözəl və mərğub bir qayda tərtib edibdir və bundan əlavə qeyriləri də bu xüsusda məqalələr və risalələr yazıblar.

Tacir dedi: Bəs birisi ki, təzə əlifba yazır və onda başqaları ona nə deyirlər? Hər yerindən qalxan təzə əlifba tərtib eyləsə - onda min cürə əlif əmələ gələr. Dedim ki, hər birisi yaxşı və eybsiz bir əlifba düzəltsə qeyriləri də bunu qəbul edərlər. Cənab Yadigarovun yazdığının məzmunu budur ki, islam əhlinin Avropa əhlindən dalıda qalmağına ümdə bais müsəlmanların əlifbasının qüsur ilə dolu olmağıdır. Belə ki, müsəlman balaları neçə illər təlim alırlar yenə də axırda oxumağa qadir olmurlar və elm təhsil etməkdə aciz qalırlar. Və həmçinin deyir ki, bəni-Abbasiyə xilafəti və müluki-ərəb ülum və fünun təhsilində aciz və məəttəl qalıb münqəriz oldular.

Əgər əlifbamız qədimi halətində və surətində baqi qalsa gedə-gedə İran dövləti və sair islam məmləkətləri dəxi batıb tərk olacaqlar. Amma əgər əlifbanı dürüst və asan etsələr ki, uşaqlar oxumaqda məəttəl qalmayalar və cavanlıq mövsümündə lazım olan elmləri təhsil edə bilələr və bu növlə gedə-gedə elm və sənətlər əhli-islam arasında tərəqqi tapa, bu halda onlar da avropalılar kimi kamil olarlar.

İranlı rəfiqim mənim bu sözlərimi eşidib fikir dəryasına qərq oldu. Bir saatdan sonra başını fikir yaxasından qaldırıb dedi: əgər filhəqiqə Yadigarov buyurduğu kimi isə, yəni əlifbanın naqis olmağı İran dövlətinin zəvalına bais isə, əlbəttə, lazımdır tezliklə onun təğyir və təbdilinə şüru etmək, ta ki, dövləti-əliyyə münqəriz olmuya və bizlər də yəhudilər kimi dünyanın üzünə dağılıb pərakəndə olmuyaq, onlar kimi hər qisim töhmət və zəhmətə düçar olub əcnəbilər nəzərində xar və zəlil olmuyaq. Vəlakin mənim zənnimə görə o adamlar ki, bu fikir və əqidədədirlər - heç şey anlamırlar, səhv edirlər və bəlkə xəbti-dimağ gətiriblər. Çünki İran əhli Yevropa əhlindən əsla geridə qalmıyıbdır. Hətta onlardan daha artıq dərəcədə tərəqqi edib rahat və kefi kök güzəran etməkdədirlər.

Belə ki, Yevropa əhlinin yeməkləri mövqufdur kələm şorbasına, qartofluya və donuz ətinə ki, onlardan min cürə naxoşluqlar törəyir, soyuqdəyməyə, bəlğəmə və qulunc azarına səbəb olur. Plovdan və çilovdan və gunagun xuruşlardan və ləzzətli təamlardan bilmərrə xəbərləri yoxdur və bir də yevropalılardan ancaq ikisi-üçü arvad alır, onda da bir nəfərini, çoxusu ömürlərini boş və bihudə keçirirlər və arvad alanların da çoxu öz arvadlarını naməhrəmə baxmaqdan və naməhrəm ilə gəzməkdən qoruya bilmirlər. Amma biz kefimiz istədiyi qədər arvad alırıq və əlhəmdülillah onlardan heç birinin qüdrəti yoxdur ki, başını qapıdan çölə çıxardıb özünü naməhrəmə göstərsin. Əgər xudanəkərdə onların birindən belə iş sadir olsa onun atasının qəbrinə od vurub yandırarıq.

*(axırı vardır)*

## HƏCV

*Şəhrimizdə belə kamil kişinin yoxdu sözü*
*Eybi ancaq budu kim azcana əvərdi gözü*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Nə qədər güclü öküz olsa onu təngə salır*
*Gavi-mahini gücündə bu öküz ləngə salır*
*Böyürəndə səsini fənd ilə bir həngə salır*
*Deyəsən yüz öküzün sövtidi bileyin özü*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Məscid içrə uzanır dal yuxarı alta yüzü*
*Başının altına minbər döşəyi məxmər üzü*
*Belə xor-xor eləyir qanmıyır əsla da özü*
*Necə məzbəldə yatar xorna çəkər çöl donuzu*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Ağzı bir yana gedib həm gözü də alça dərər*
*Şam vəqtində, xörək vəqti öküzlərlə gələr.*
*İnciməz başına ya palka dəyə, ya ki təbər*
*Çox qalındır nə qanır jarkanı ya ki marozu*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Gah misbahə tərəfdar olu gəh Şeyx Əliyə*
*Yoxdu aqillər ilə kari, köməkdir dəliyə*
*Hüsndə, xülqdə təşbehdi o kərtənkəliyə*
*Nə qədər axtarasan yoxdu bunun misli sözü*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Nitqini görsə əgər bülbül olur lal yəqin*
*Gavlər nitqə gəlir həm olu xoşhal yəqin.*
*Cəngəlistanda tapılmaz belə çaqqal yəqin*
*Çalğılarda bəyənibdir bu cavan diblibozu*
*Baş böyük, peysəri canlı, necə Yaycı öküzü.*

*Təzə şair*

## RAZILIQ

Dörd taxça kitab təxminən yüz cilddən artıq olaraq yazıb məlum edirik: Allah Səlyan əhlindən razı olsun. Hacı Məhəmmədi bizdən rəf edib öz yanlarına apardılar, ondan ötrü ki, Hacı Molla Babanın vəsiyyətinə görə o həmişə biz fəqir kitabların birinə baxanda əllərini çirmələyib bizdən birini götürüb aparıb camaat nəzərində əvvəl xublu bizi isladıb üç dəfə də salavatlayırdı.

Genə kifayət etməyib bizə bir qüsl də edər idi. İndi o gedəndən biz rahatdayıq. "Molla Nəsrəddin" vasitəsilə Səlyan əhlinə razılıq edirik. Allah rizasından ötrü məbada onu bu tərəfə göndərsinlər ki, biz güc ilə dincəlmişik.

*İmza: Vəkili-kitabi-şərhülləmə*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## YENİ İRŞAD

**ABUNƏ QİYMƏTİ**

*Abunə qiyməti bu qərar ilədir:*
*Bakıda və Rusiyanın sair şəhərlərində:*

İlliyi..........10 manat.
Altı aylığı..........6 manat.
Üç aylığı.......... 3 manat.
Bir aylığı.......... 1 manat.

*Məmaliki-əcnəbiyyədə:*

İlliyi..........14 manat.
Altı aylığı..........8 manat 50 qəpik.
Üç aylığı.......... 4 manat 50 qəpik.
Bir aylığı.......... 1 manat 50 qəpik.

**Qeyd:** *1912-ci il üçün bir dəfəlik 10 manat abunə pulu verən müştərilərə nəşr etdiyimiz böyük islam təqvimindən bir nüsxə göndəriləcək.*

*"Yeni İrşad" idarəsi*

## 1912-Cİ SƏNƏ HESABINA

"Tərcüman" qəzetəsinin və bərabərində nəşr olunan "Aləmi-sibyan" vərəqəsinin müştəri dəftəri açıldı. Rusiyanın cümlə poçtaxanalarında yazılmaq mümkün; doğru idarəyə müraciət dəxi açıqdır, məsləkimiz məlum və sabitdir; milli məktəb, milli lisan və ədəbiyyata dair məvad əsas tutulacaqdır. Sənəliyi 4, altı aylığı 2 və üç aylığı 1 rublədir.

**Bağçasaray-idarə**

*Адресь: г. Бахчисарай, Таврич. губ. Редакция "Терджимань"*

## İDARƏDƏN ELAN

Möhtərəm müştərilərimizə məlum edirik ki, məcmuələri çatmayanda tezliklə idarəmizə xəbər versinlər və abunələrinin nömrəsini də yazsınlar.


Yəzdi məzhəb
İsmaili məzhəb
Vəhabi məzhəb
Fatmeyi məzhəb
Şeyxi məzhəb
Laməzhəb
لا مذهب
İslam
اسلام
Safei məzhəb
Şiə
شیعه
Babi
بابی
Hənbəli məzhəb
Sünni
Maliki məzhəb

6 səfər 1330 **Yeddinci il** 13-го января 1912 г.

# ملا نصرالدین

№2 Qiymәti 12 qәpik. **МОЛЛА НАСРЕДДИНЪ** Цена 12 к. № 2




Litoq. S.Bıxova.

*– Saat neçәdi?* *– Qoy bir Günә baxım görüm saat neçәdi.*

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində:12 ay--altı manat.
6 ay..........................................3 manat yarım.
3 ay..........................................2 manat.
Kasıblara...................................12 ay--5 manat.
*6 ay..........................................3 manat.*
3 ay..........................................1manat 60 qəpik.
1 ay..........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay........................................7 manat.
6 ay..........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*6 səfər 1330* *hər həftə nəşr olunur* *13 yanvar 1912*



## PƏK EYİ

Mənim dava-mərəkəynən işim yoxdur. Mən bir fağır adamam. Ancaq bunu gücnən qəzetədə oxudum ki, İskəndərbəy Məlikov deyir gərək biz türk dilimizdən "çox yaxşı" sözlərini ataq, onun əvəzində osmanlının "pək eyi" sözlərini işlədək.

Mən elə hazır idim İskəndərbəyin nəsihətini qəbul eləyəm və genə elə hazıra yavuqam, amma bir iş qabağımı kəsib. Dünən küçədə bir gəncəli mollaya rast gəldim. Xəyalımda da bu idi görüm, söz düşsə bu axund nə tövr danışacaq: "Pək eyi" ləfzini işlədəcək, yainki "çox yaxşı"...

... Hə, nə var, nə yox, sağlığın. Gəncədə nə var, nə yox, sağlığın. Kərbəlayi Səkinə xanımın keyfi necədi? Axund cavab verdi ki: "Çox yaxşıdır".

Bay, gör bu nə danışır, pəs niyə demədi "pək eyi". Mən öz-özümə güman elədim ki, bəlkə axund bu dəfə səhv elədi. Genə soruşdum ki: "Axund, doğrudurmu Kərbəlayi Səkinə xala indiyə təki iki yüz dəfə siğə olub".

Bəli, bəli doğrudur və çox yaxşı eləyib, çünki bu bir xeyir işdir, feyzi çoxdur.

Dedim, cənab axund, Kərbəlayı Səkinə xalanın hələ söhbəti qalsın, amma təəccüb ki, siz bilmirsiniz ki, gərək bundan sonra "çox yaxşı" sözlərini işlətmiyək, "pək eyi" deyək.

Amma axund mənə bir mənasız cavab verdi: axund cavab verdi ki, pəs belə olanda bizə ata-anadan qalan "çox yaxşı" sözlərini hara qoyaq?

Mən buna bir cavab tapa bilməyib dinmədim.

Doğrudan, bu özü bir danışmalı mətləbdir, çünki Gəncə axundundan savayı genə iki nəfər əhli-qələmlərimiz ilə bu xüsusda göftgumuz olub, ikisi də mənə bu cavabı verdilər:

Məsələn: dünən bir naxçıvanlı babisi ilə danışırdım, özünün etiqadı ilə işim yox, amma kitabət əhli olduğundan bu xüsusda onun rəyi mənə lazım gəldi.

Bəhanə üçün soruşdum ki, nə səbəbə Naxçıvana bir təzə rəis varid olanda, iki nəfər müsəlman taciri bir-birinin acığına vağzaldan yapışırlar yazıq məmurun qollarından: biri bu yana dartır ki, gərək bizə düşəsən, biri o yana çəkir ki, gərək bizə düşəsən. Axırda bu iki Allah bəndəsi dükan qonşuları bütün ili bir-birinə düşmən olurlar.

Naxçıvanlı bir qədər fikir eyləyəndən sonra dedi: Çox yaxşı eyləyirlər. O səbəbə ki, biz müsəlman içində əgər birinin bir böyüklə münasibəti, gediş-gəliş və dostluğu olmadı, onu saymırlar. Amma müsəlman içində nə qədər böyüyə itaət eləsən, o qədər də camaatın içində hörmətin olur.

Dedim - Bunda sözüm yox, amma "pək eyi" əvəzinə "çox yaxşı" dediyinin səbəbini mənə söyləsin. Bu da mənə haman cavabı dedi: dedi, bir yer tap ki, atamdan qalan "çox yaxşı" sözlərini qoyum, sonra sənin təzə dilini qəbul edim.

İndi mən də deyirəm ki, Minasazovnan, qeyrisilə işim yoxdur, sən əgər deyirsən ki, gərək biz öz dilimizdən "çox yaxşı" sözlərini atıb gənşalvar osmanlıların nadan kəndlilərinin hər xüsusda kobud "pək eyi" sözlərini işlədək, onda sən də mənə gərək deyəsən görüm, "çox yaxşı" sözlərini hara qoyum.

Elə bircə bunu mənə de, dəxi sənnən işim yoxdur.

*Molla Nəsrəddin*

## TAZİYANƏ

*Çünki namusun ziyanı var tənə*
*At onu, qeyrətlilik bihudədir*
*Ey əzizim, bir nəsihətdir sənə*
*Kim ki, binamusdur, asudədir.*

*Kefsiz*

## REVİZİYA

Məlumdur ki, bizim mahal qaziləri kənd məktəblərini dolanıb reviziya etməkdə çox səy edirlər. Necə ki, bu il Quba qazisi reviziyaya gedən vaxt atdan yıxılıb qıçı sınıb (Allah şəfa versin). Şuşa qazisi də reviziyaya gedəndə ağa körpüsündə faytondan yıxılıb (Allah öz birliyi xatirinə salamət eləsin). Göyçay qazisi də yolda soyuq alıb naxoş olub (Xudaya pənah). Cavanşir qazisi də reviziya zəhmətlərindən o qədər zəif düşüb ki, bu saat İrandan gələn kazonni həkimi müalicə eləyir. Naxçıvan qazisi də əsla şəhərdə tapılmır, həmişə kəndləri reviziya eləməkdədir.

*İmza: Mığmığ*

## Şəkil

Əməlin yox, adın müsəlmandır,
Surətin, batinin yox, insandır,
Sənə insan deməkdə böhtandır,
Yırtıcısan, yerin neyistandır,
Səndən insan olan girizandır.

Mütənəffirdi səndən insanlar,
Səni bilmir bəşər müsəlmanlar,
Sahibi-elm, əql, vicdanlar,
Sənə öz xaliqin düşməndır,
Səni xəlq etmədən peşimandır.

Yaradıbdır məgər səni Allah
Ki ola məhv əlində xəlqüllah,
Nədi bu zülm ey ədüvvüllah,
Ləhzə-ləhzə yüzi yerin qandır,
Nədi bunca əcəb, nə tüğyandır!

Özgələr -------------- aşına
Dörd tərəfdən qapazlayır başına,
----------------------- yaşına,
Al əvəz qardaşından, asandır,
Xaneyi-din əlinlə virandır.

Mən bilə bilmirəm nə cövhərsən,
Necə nütfə zina pəsərsən sən,
Toxmi-iblis, mayeyi-şərsən,
Atəşin də biladi-suzandır,
Bədənim hər dəqiqə lərzandır,
Dağınıq huş, dil pərişandır,
Allah-Allah bu hansı dövrandır?

*Kefsiz*

## ŞİKAYƏT

*Cənab fazil və ədibi-kamil, Molla Nəsrəddin!*

Bəndə, bir nəfər molla, ismim Molla Ələkbər Həsənzadə, bu il Novorossiysk şəhərinə varid oldum ki, burada alma satan kasıb müsəlman qardaşlara mərsiyə oxuyam. Amma oxumadan qabaq mən bu qardaşlara xəbərdarlıq verdim ki, ay mənim əziz din qardaşlarım, bax, mən sizə oxuyuram, amma bunu da bilin ki, mərsiyə də var, mərsiyə də var. Mən sizə "Qumri" kitabından oxuyacağam, nəinki bir özgə kitabdan.

*Dörd il əvvəl müctəhid Hacı Mirzə Həsən ağanı Təbrizdən qovanda*






- Ay bacı, Kərbəlayı Sadığın evi hansıdır?
- Ay bacı, Kərbəlayı Sadığın evi hansıdır?
- Ay bacı, Kərbəlayı Sadığın evi hansıdır?
- Bacı, sən Allah bir cavab ver.

- Машади Джафарь, куда ты идешь?
- Иду вь Азовский банкь: хочу повидаться сь директоромь.
- Məşədi Cavad, hara gedirsən?
- Gedirəm Azovski bangə, orada bu gün direktor ilə çox vacib işim var.

Bəli, oxudum. İndi bax bu nainsaflar feyziyab olandan sonra və behiştin biletini bitli ciblərinə qoyandan sonra gör mənə nə verirlər? Həştadca manat. Vallah azdı, billah azdı. Axır insaf da yaxşı zaddı. And olsun axund Hacı Molla Həsən Mollazadənin gəncəli qardaşların yolunda göstərdiyi ali xidmətə ki azdır.

*Molla Nəsrəddin:*

Təəccüb edirik ki, Novorossiysk müsəlmanları nə səbəbə mərsiyəxanlar ilə belə soyuq rəftar eyləyirlər və lazımi dərəcədə qulluq etmirlər. Bir baxsınlar Tiflisdə iranlı qardaşlara ibrət eləsinlər.

## FELYETON

*(Keçən nömrənin axırı)*

Bundan əlavə bilmək lazımdır ki, hansı elm ilə biz mənfəətbərdar ola bilərik və ondan bizə nəf yetişəcəkdir. Bizim tərəqqi ya tənəzzülümüzə onun dəxli vardırmı? Pəs əvvələn bizə vacibdir ki, lazım olan elmləri dürüst təyin edək ta ki, hər cəfəngiyyata elm adı qoyub onun dalına düşməyək. O elm ki, bizim - yəni ərbabi-şüurun nəzərində elm hesab olunur onlar bundan ibarətdir:

Sərf və nəhv və məntiq və məan və bəyan və fiqh. Elmi-nücum da filcümlə ülumi-lazimədən hesab oluna bilər. O ki elmi-sərf və nəhvdir və məntiq və sairləridir bunlar ərəb dilini bilməkdən ötrü bizə lazımdır. Ta ki Quranı və hədisləri oxuyub mənasını anlayaq. Elmi-fiqhdir - o da lazımdır şəriəti öyrənməkdən ötrü. O ki elmi nücumdur onu da bir o qədəri bilmək lazımdır ki, ayın əvvəlini və axırını təyin edə bilək və saatların təhvil etməyi, nəhs və sə'd günlərini piş əz vəqt anlayaq, ta ki şəxs qəflət edib qəmər əqrəbdə olan vaxtı işə şüru etməsin, səfərə çıxmasın, alış-veriş etməsin, təzə libas biçdirməsin, həcamət qoydurmasın və habelə.

İndi buyurun görək sair elmlərdən ki, Yevropa əhalisi yad edib öyrənirlər bizə nə mənfəət hasil ola bilər? Biz ki əhli-İran varıq, bizim o qədr cibilli qabiliyyət və hünərimiz var ki, yevropalılara məxsus olan elmlərsiz də gözəl zindəganlıq edirik. Hətta çox möhkəm və qate dəlillərimiz vardır ki, onların elmlərindən bizə bir mənfəət yetişə bilməz. Məsələn, coğrafiya elmi: əgər bizə məlum ola ki, Əlvənd dağı yeddi min dərəcə səthi-dəryadan ucadır, bundan bizim üçün nə mənfəət və fəzilət hasil ola bilər? Və ya filan şəhərdə nə qədər cəmiyyət zindəganlıq edir - bundan bizə nə mənffət yetişə bilər? Və ya filan dəniz nə sayaqdır? Aya kim bilmir ki, dənizin suyu şordur və onun balığı haramdır? Və habelə hesab elmini oxuyub yadda saxlamağa bizim nə ehtiyacımız var? Bir halda ki, biz hesabı elmsiz də yaxşı bilirik. Aya İran tüccarının hansı birisinə bir tümən pul verib hesabında bir fülus ondan artıq almaq olar? Hələ gərəkdir ehtiyatlı olmaq ki, səni aldadıb səndən bir şey artıq öz xeyrinə çəkməsin. Və ya kim deyə bilər ki, iranlı muamiləçilər pullarına muamilə almaqda bir qəpik səhv edirlər?

Təbabət elmini öyrənməyi dəxi o vaxt lazım bilərdik ki, təbiblərimiz müalicələrini cövhəriyyat vasitəsilə icra edəydilər. Bir surətdə ki, onların müalicəsi ələfiyyat ilə olunur, daha onu təhsil etməyə nə hacət, ələlxüsus bizlər üçün ki, Allah-təalanın təqdirinə bizim etiqadımz möhkəmdir. Ölmək və şəfa tapmaq təqdiri-xudaya mövqufdur və həmçinin İran mühəndislərinin və memarlarının əsla mühəndislik və memarlıq elmlərindən xəbərləri yoxdur və lakin onların tikdikləri imarətlər yevropalıların təmiratından qəşəng və möhkəmdir və lağım atmaqda və su çıxartmaqda bizimkilərin yədibeyzaları var.

Fizik və elektrik elmlərini dəxi oxuyub təhsil etmək bizə lazım deyil. İngilislər elə bir tayfadırlar ki, xudavəndi-aləm onların vücudunda büxl və həsəd yaratmayıbdır. Belə ki, küllü pul töküb hər yerlərə və məmləkətlərə teleqraf məftili çəkiblər və hələ bizim üçün müftə dəmiryolu qayırmaq fikrinə düşüblər. Şəkil çəkmək və nəqqaşlıq elmi də şəriətimizin hökmüncə haramdır ki, o barədə danışmağımız əbəsdir. Aya heç bilirlərmi ki, əlifbanın təğyiri zimnində nə qədər zərərlər vardır? Əgər əlifbamızı dəyişsək, İran katiblərinin və xoşnəvislərinin bu qədər zəhməti puç və zaye olacaqdır. Heç bilirlərmi ki, nə qədər xoşxət ilə yazılmş ziqiymət kitablarımız var, məgər onları yandıracaqlar və ya çölə atacaqlar? Və bir də ki əlifbamızı dəyişdirib oxumaq-yazmağı asanlığa çıxarsaq, onda bizim arvadlarımız və qızlarımız da asanlıqla oxumaq-yazmaq öyrənəcəklər və onlar ilə naməhrəm kişilərin arasında irsal-mərsul və naməşru əlaqə vüqua gələcəkdir. Və bir də əlifba təğyirinin qəsdinə düşən adamların qövlünə görə gərəkdir yazımız da soldan sağa olsun, necə ki, nəsara millətlərinin yazısıdır. Məgər onlar bilmirlər ki, bizim evlərdə stol-kürsü yoxdur və stolkürsüsüz də soldan sağa yazmaq mümkün deyil. Belə olan surətdə gərəkdir biz ata-babamızın adətini və Xorasan və Fərahən qalılarını və Yəzdəgürd keçələrini ki cəmi dünyada onların şöhrəti var - ataq və kürsü üstündə oturmağa ki bel ağrısına və bir para mərəzlərə baisdir - təzədən adət edək və bunların hamısı nədən ötrü? Soldan sağa yazmaqdan ötrü. Bilmirəm nə səbəbə bu cənablar bizlərə - ki əlhəmdüllillah əhli-islamlıq – məsləhət edirlər ki, küffarə təqlid edək və əlifbamızı dəyişdirib soldan sağa yazmağa adət edək, nə üçün onlara məsləhət görmürlər ki, onlar öz əlifbalarını dəyişdirib sağdan sola yazsınlar?

Çün gördüm ki, iranlı rəfiqimin Yevropa elmlərinin bizə lazım olmadığı barəsində gətirdikləri dəlillər xeyli qüvvəli və möhkəmdir, ona binaən cavabını əlifba yazanlara həvalə etdim…

## VAQONDA

Keçən həftə Bakıdan Tiflisə gələndə vaqonda bir müsəlman tacirinə rast gəldim. Vaqon darışıqlıq idi, bir kupedə doqquz adam oturmuşduq. Qalanlar bilmirəm nə millət idi, amma rusca danışırdılar. Müsəlman qardaş oturmuşdu qapıya tərəf və bir söz danışmırdı. Başındakı papaqdan bildim ki, mömin bəndələrdəndir. Mənim başımdakı hərçənd papaq deyildi, şlyapa idi, amma müsəlman qardaş deyəsən duydu ki, mən müsəlmanam. Çünki birdən-birə üzünü mənə tutub soruşdu: "Cənabınız hara gedirsiniz?" Dedim: Tiflisə. Dəxi bir söz deməqdi, amma diqqət ilə baxdı üzümə. Mən də ondan soruşdum ki, hara gedir, o da mənə cavab verdi ki, gedir Qarayazıya, adamları pambıq alıblar, gedir baxsın görsün, nə cür pambıqdır və gələcəkdən ötrü qərardad eləsin. Maşın bir stansiyada dayandı və müsəlman qardaş məndən soruşdu ki, mən nə işə baxıram. Mən də cavab verdim ki, bangda qulluq eyləyirəm. İsmi-şərifimi də soruşdu, ismi-şərifimi də ona söylədim. Təzə xəbərdən zaddan nə var, nə yox? Nə ərz eyləyim çoxdandı qəzetə-zada baxmıram.

Mənim yadıma düşdü ki, Bakıda "Məktəb" adında uşaqlara məxsus təzə bir məcəllə çıxmağa başlayıb. Müsəlman qardaşa üzümü tutub soruşdum ki, Bakıda çıxan qəzetlərdən heç gətirir və "Məktəb" məcmuəsindən xəbəri var ya yox? Bu sualımın cavabında müsəlman qardaş da məndən bunu soruşdu: Cənab Mirzə Həsən, siz ki, bankdə qulluq eləyirsiniz gərək biləsiniz ki, Rusiya ilə Amerikanın tamojna davasından pambıq aləminə nə təsir ola bilər. Bu yavuqda da olmasa, gələcəkdə pambığın bahalanmağına ehtimal ola bilər, ya yox?..

Müsəlman qardaşa mən cavab verdim ki, doğrudur, mən bangdə qulluq edirəm, lakin bang idarəsi politika işlərinə o qədər vaqif deyi, necə ki, o güman eləyir. Bununla belə mənim ağlım belə kəsir ki, Rusiya və Amerikanın tamojna pozuşmağı uzun çəkə bilməz və Amerika pambığının Rusiyaya daxil olmağını kəsmək mümkün deyil. Demirəm bəlkə iyirmi otuz ildən sonra Səmərqənd və Muğan səhralarını suluyub pambıq əkini əmələ gətirələr, yoxsa indilikdə Amerika pambığı Moskvaya daxil olmasa, Rusiyada çox-çox fabrikalar yatar və min-min əmələ acından ölər.

Bu sözü deyib axırda müsəlman qardaşımdan təvəqqe elədim ki, o da mənim sualıma cavab versin. Qəzet oxuyur, ya ox, təzə çıxan "Məktəb" məcmuəsindən xəbəri var, ya yox?

Bu sözün cavabında müsəlman qardaş əlini uzatdı cibindən bir sıxma, yumşaq bir şey çıxartdı tutdu mənim qabağıma və dedi: "Bir iltifat elə".

Çünki vaqon o qədər işıq deyildi, mən dostumun ovucundakını kişmişə oxşatdım və dedim ki, "Bağışlayınız mən yemirəm". Xeyr, yeməli deyil, bağışlayasınız, bu Margilan pambığının toxumudur ki, əsli cinsi Amerika cinsidir. Həmin bu pambığı Moskvada "Torqovi promışlenni" adında təzə bir ticarət şirkəti aparıb Mavərayi-nəhr torpağında əkir. Təəccüb budur ki, oraların torpağı pambığı eləcə yaradır, necə ki, Amerika pambığı. Amma bizim bədbəxt Qafqaz torpağı pambığın xasiyyətini də dəyişib genə öz yerlərimizin pambığına oxşadır və Səmərqənddə putu beş manata gedəndə bizim torpaqdan bitən həmin toxumun pambığına 3 manat 3 şahıdan artıq verməyirlər.

Söz yox, belədir və mən təsdiq elədim.

Qonşularımızın biri yuxarıdan bir səbət götürüb bizi basa-basa çıxdı. Bir az sakitlik oldu. Amma mənim nə tövrsə səbrim gəlmədi və müsəlman qardaşa dedim ki, bu sözlər doğru, Amerikadan, Moskvadan və Margilandan xəbərdar olmaq üçün genə mətbuat lazım, qəzet oxumaq lazım, savad və elm lazım və gələcək üçün ticarət meydanında çalışmağa, uşaqlara elm öyrətmək lazım. Həmin ümumi nəsihəti söyləyib genə soruşdum ki, "söz yox, Bakıdan müsəlman qəzeti gətirdirsən?"

Müsəlman qardaş bir cavab verməyib cibindən dəsmalını çıxardıb burnunu sildi, genə dəsmalını qoydu cibinə.

Mən genə dedim: Məsələn, biz deyirik tərəqqi, tərəqqi. İndi odur Bakıda uşaqlara məxsus "Məktəb" adında bir jurnal çıxır.

Söz yox yaxşı olar ki, belə-belə şeyləri oxumağı indidən uşaqlarımıza adət etdirək ki, həmi savadları artsın, həmi də...

Müsəlman qardaş mənim sözümü yarımçıq qoyub tez durdu ayağa və dedi:

"İndi gərək ki, yetişəcəyik Yevlax stansiyasına: qoy bir görüm". Bu sözləri deyib qapıdan çıxdı.

*Məşədi Mozalanbəy*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## TƏŞƏKKÜR

Fəxr edirik ki, maarif qədri bilənlərin sədası genə hərdənbir camaatımızın içindən qulağımıza çatıb bizi xoşhal eləməkdədir.

Şamaxıya çox da yavuq olmayan Qoşqu qəsəbəsinin müsəlman qardaşları mərhum Sabiri yaddan çıxarmayıblar. Necə də ki həqiqətdə onu yada salmamaq mümkün deyil.

Bu aşağıda adları yazılan Qoşqu əhalisi şair mərhumun uşağına bir qədər pul göndəriblər, bu qərar ilə: Qəzənfər Cəfərov - 3 manat, Səftər Rzayev - 3 manat, Məşhədi Hüseyn Şəkili - 2 manat, Məmmədəli Hüseynov - 3 manat, Mehdi Lahic - 2 manat, Əkbər - 2 manat. Cəmi: 15 manat.

Həmin 15 manatı bu gün göndərdik poçta vasitəsilə Şamaxıya Hacı Əbdürrəhim Səmədov cənablarına ki, o da zəhmət çəkib yerinə yetirsin.

*"Molla Nəsrəddin" idarəsi tərəfindən*

## İDARƏDƏN ELAN

Möhtərəm müştərilərimizə məlum edirik ki, məcmuələri çatmayanda tezliklə idarəmizə xəbər versinlər və abunələrinin nömrəsini də yazsınlar. Keçən ildən hər kəsə məcmuə borcumuz qalırsa, onu da yazsınlar.

13 səfər 1330 **Yeddinci il** 20 января 1912 г.

ملا نصرالدين

№3 Qiyməti 12 qəpik. **МОЛЛА НАСРЕДИНЪ** Цена 12 к. № 3



**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində: 12 ay--altı manat.
6 ay.......................................3 manat yarım.
3 ay.......................................2 manat.
Kasıblara................................12 ay--5 manat.
*6 ay.......................................3 manat.*
3 ay.......................................1manat 60 qəpik.
1 ay.......................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay.....................................7 manat.
6 ay.......................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə.......................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*13 səfər 1330* *Hər həftə nəşr olunur* *20 yanvar 1912*


## AXUND HACI MOLLA RUHULLA

Gərək güman olunmayaydı ki, yer üzündə elə bir alçaq adam tapıla bilər ki, 55 yaşında möhtərəm bir alimi namaz qıldığı yerdə qətlə yetirməyi rəva görə. Bəli, tapıldı, bir belə adam yanvarın 16-da Bakıda Axund Hacı Molla Ruhullahı güllələyib öldürdü.

Əgər millətimizin yolunda mərhumun heç bir xidməti olmasaydı, genə onun ölməyinə təəssüf etmək olardı, amma ruznamələrdə axundun nə qədər camaat üçün çalışdığını oxuyub nəhayət dərəcədə qəmgin olduq.

*«Molla Nəsrəddin» idarəsi*

## ÇİÇƏK

Bir müsəlman kəndinə, müsəlman məhəlləsinə "çiçək" kimi müalicəsi asan bir uşaq naxoşluğu düşəndə, yazıq uşaqlar bir-bir başlayırlar qırılmağa.

Çox vaxt olur ki, naxoşluq elə o vədədə qurtarır ki, dəxi o kənddə, o məhəllədə bir nəfər də uşaq qalmır.

Məlumdur ki, çiçək naxoşluğunu o uşaqlar tutur ki. Onlara çiçək döyülməyibdir.

Yəni əgər uşağa vaxtikən çiçək mayasını döyəsən, dəxi o uşaq çiçək naxoşluğu tutmaz, amma həkimlər məsləhət görürlər yeddi ildən sonra genə uşağın çiçəyini döymək.

***Xülasə...***

Bu bir asan işdir, çiçəyin mayası hər bir aptekxanada satılır. Ancaq lazımdır ki, kənddə ya məhəllədə bir elə adam olsun ki, biçarə müsəlmanlara yazığı gəlsin.

Bir neçə qəpiklik nəştər, bir neçə qəpiklik maya, aptekçidən soruşsan ki, çiçəyi nə tövr döyüm, örgədər həkimdən soruşsan daha yaxşı, feldşerdən də öyrənə bilərsən, bunlar hamısı asandır, amma lazımdır ki, məhəllədə ya kənddə balaca günahsız uşaqlar qırılanda və anaları-ataları ağlar qoyanda elə bir Allah bəndəsi olsun ki, sahibsiz, dilsiz-ağızsız, avam müsəlman qardaşlara rəhmi gəlsin.

Bir-iki manatlıq çiçək mayası ilə bir-iki kəndin uşaqlarının çiçəyini döymək mümkündür. Əgər belə olsa o vilayətdən çiçək azarı bilmərrə kənar olar.

Bunu kim eləsin? Kimdir kəndlərdə avam camaatın sahibi? Bu xüsusda bir neçə cavab ola bilər: biri deyə bilər ki, kəndlilərin xeyir-şərinə qarışmaq, onların halına yanmaq mülkədarların, bəylərin və xanların borcudur.

Biri deyə bilər ki, kəndlilərə baş çəkmək, onlara yetişən bəlaların qabağında çalışmaq, kəndlilərə atalıq eləmək mollaların vəzifəsidir.

Mən bu iki cavabın heç birinə şərik ola bilmərəm, çünki bəylərin, xanların və mülkədarların kəndli işinə qarışmağın heç bir yaxşı nəticəsi ola bilməz və bir də yaraşan iş deyil ki, təşəxxüslü bir mülkədar, papağı yanqılıcı bir bəy, ya kefli bir xan girsin kəndlinin evinə ki nə var, nə yox, mən gəlmişəm sənin uşağının çiçəyini döyəm. Kəndli bir nanəcib tayfadı, üz versən qudurar, dəxi öhdəsindən gəlmək olmaz. Onsuz da axır vaxtlarda kəndlərdə də bir para cavanlar az qalırlar adamın sözünü qaytarsınlar və üstünə çığırıb söyləməyincə böyüyə baş endirmirlər.

Qaldı mollalar.

Bunlar da iki cəhətdən kənd uşaqlarının səlamət olmağını istəmirlər. Bir cəhəti budur ki, uşaq ölən evdə həmişə molladan ötrü doşab halvası, bəzi yerlərdə ət şorbası bişir, az-çox da pul verilir, demək gündə kənddə bir naxoşluq düşəndə mollanın da mədaxili artır. İkinci cəhəti budur ki, o uşaqlar ölməsələr qalsalar, iyirmi-otuz ildən sonra gözlərini açıb yada salacaqlar ki, otuz il ondan qabaq Bakıda qradonaçalnik küçələrdə arvadlara sataşan cavanlara tənbeh eləyəndə, cavanlar qradonaçalnikə belə cavab vermiş imişlər:

"Ərz olsun qradonaçalnik cənablarına ki, biz həqiqətdə müqəssirik, çünki küçə ilə keçən övrətlərə söz ilə sataşmışıq, amma cənab qradonaçalnik sağ olsun, necə ki hər bir müqəssirin tutduğu pis əməlini zəmanənin təğazasına və məkana nisbət mülahizə edəndə onun günahını bir növ xəfif tutub tənbehini də o dərəcədə azaldırlar, biz Allahın günahkar bəndələrinin əhvalına lazımınca diqqət edəndə aşkar olacaq ki, bizim də üzrümüz az deyil".

Bəli, küçə ilə keçəndə övrətlərə sataşmaq yaxşı adət deyil, amma biz rus millətiyik, biz sataşdığımız övrətlər də rusdurlar, bizim hələ onlar ilə danışmağımıza da dinimiz yol verir.

Amma bizim gözümüzün qabağında var Qafqazın müsəlman tayfası: müsəlman içində heç bir övrət cürət eləməz ki, müsəlman kişilərinin içindən ötüb keçsin, çünki ola bilməz ki, o övrətə bir söz atan olmasın.

Mən cahıl-mahılları demirəm, hər millət içində cahıllar və cavanlar tərəfindən küçə-bacada övrətə sataşmaq görünür.

Mən mollaları deyirəm.

Müsəlman içində hər kənddə və hər şəhərdə bir Molla İsa var. Çox vaxt özləri üçün mutə siğələrini mollalar küçədə oxuyurlar. Övrətin topuğuna baxan kimi zalım oğlu bilir ki, bu övrət kimdir və fürsəti fövtə verməyib nişanə qoyur. Gəncədə Hacı Seyid Bağır özü üçün siğə elədiyi övrətləri küçələrdə tapır. Naxçıvanda Pirqəmişli mərhum bir molla xoşuna gələn övrətə küçədə deyərdi: mənə siğə olarsan? Mən çox görmüşəm ki, mötəbər və sahibi-ehtiram bir axund küçədə yad övrətdən soruşur ki: "sən kimin övrətisən?"

Söz yox övrətlərimizin qulaqları o qədər qızışıb ki, belə-belə şeylərdən incimirlər. Çünki elə bilirlər ki, bu özü də Allah əmridir. Bəlkə namünasib bir cavan oğlan küçədə bir dul övrətə sataşsa, övrət daşı götürüb çırpar uşağın başına, amma hacıya və mollaya söz yoxdur, çünki övrət görür ki, burada siğə olmaq məsələsi var və övrətlərimiz də öyrəniblər.

Gəncədə Kərbəlayi Səkinə ömründə iki yüz adama siğə olub. Hacı Seyid Bağır küçədə hansı dul övrətin baldırını yoğun görəndə, övrətə belə deyir: "əgər mənə siğə olmasan, cəddim ciyərini çıxardacaq".

Onunçün hər şəhərdə Kərbəlayi Səkinə xalalar az deyil. Ruhani atalarımızın tərbiyəsinin bərəkətindən, indi bizim övrətlərin içində elələri də var ki, siğə olmağı özlərinə bir peşə kimi eləyiblər. Çoxusu bəlkə özü kişiyə deyir ki: məni siğə elə. Xorasanı demirəm, orada belə işlər hər qədəmdə görünür, bizim içimizdə də hər kənddə və hər şəhərdə belə xalalar tapılar.

Margilanda Cürəxan adında bir sart qızı küçədən keçən iranlı və qafqazlını zornan tutur ki, gərək məni siğə eləyəsən. Amma lazımdır bunu bilmək ki, çiçəyi döyülən uşağı soyuq yerdə saxlamaq yaxşı deyil.

*Molla Nəsrəddin*

## DƏYƏNƏK

*Belə bir əsrdə kim elmi-maarif günəşi*
*Saçıb öz nurunu hər bir təbəqat üstündə*
*Döyüşürlər, söyüşürlər, küsüşürlər yenə də*
*Naxçıvan mollaları bəhsi-zəkat üstündə.*

*Cüvəllağı bəy*

## ORENBURQ XƏBƏRLƏRİ

Qarğalıdan - şəhərimizin bəzi bir imanı zəif adamları apteka açmaq və telefon gətirmək kimi islamlara heç yaqışmayan işləri meydana qoymaq fikrində isələr də, əhli və xüsusən mollalar bu işə heç rüxsət verməyəcəklər.

Orenburq - kəndi kəndinə bəylik titulu və böyük artistlik namını verib iftixar edən İlyas bəy - Qudaş - Aşqadar - Ural və Saqmarski cənabları bir qaç dəfə teatr oynayıb, səyyar truppası ilə başqa şəhərlərə əzimət etmişdir.

## TAZƏ İLƏ

Oxu ey tazə il! Bu il bizə lay-lay qucağında
Doyunca yuxlayıb ta bir deyək oxqay qucağında.

Edək ta uyqudan kami-dili-divanəni hasil
Beş ildir uyqusuz qaldıq, degildir yatmamaq qabil.
O kim yatmır gecə-gündüz, degil ol binəva aqil
Çalışsın qoy o biqeyrət, bizə ver pay qucağında
Doyunca yuxlayb ta bir deyək oxqay qucağında,

Oyanıqlıq bizi bərbad qıldı, eylədi viran
Silindir börklü, sirtuqlu müsəlmanlarda yox iman
Bəlası onların tutdu bizi, döndü geri dövran
Gözüm qoy görməsin, gizlət bizi ey vay qucağında
Doyunca yuxlayıb ta bir deyək oxqay qucağında.




Mən biçarə dörd ildə ki, zəhmət çəkib xərc qoyub dörd yüz kitab çapa vermişəm, dörd kitab satmışam.
За четыре года, четыре книги.



*Kürdəmirdə başyaranlar*
*(Aşuranın sabahısı günü)*



Yevlax vağzalında Maşının gəlməyini gözləyirik.

*Въ ожиданіи прибытія поезда.*



Maşın gəldi.

*Поездъ прибылъ.*

Soğanlartək soyulduq, qalmadı pul, abru getdi
Qəzet al! Məktəbə ver! Et ianə! Nobəno... getdi!
Döyül, danlan, söyül, dinmə, təharət yox, vüzu getdi.
Yatırt dincəlt bizi, ta olmuyaq rüsvay qucağında
Doyunca yuxlayıb ta bir deyək oxqay qucağında.

Nə dəxli var bizə meydanda qaldı təkcə osmanlı
Və yainki zəhərləndi, cavanmərg oldu iranlı.
Və yainki əzir, pamal edir cansızları canlı
Verir də xud müsəlmana, müsəlman vay qucağında
Doyunca yuxlayıb qoy biz deyək oxqay qucağında.

Məarif yox kimi, əxlaqlar pozğun, ticarət yox
Hünər, sənət, qaçaqlıq, oğurluq, qətl, istirahət yox
Fəlahət yox, səfahət bol, zəlalət bol, ziraət yox
Dilənçi, falçı, molla, seyid on min say qucağında
Doyunca yuxlayıb qoy biz deyək oxqay qucağında.

Suda üzsün, havada uçsun əğyar, almarıq ibrət
Bizi gər qətli-am etsə əcanib, etmərik qeyrət
Nə lazım zəhmətə düşmək, nə qədri əldə var fürsət
Qalaq yanvar, fevral, mart, aprel, may qucağında
Gecə, gün, vəqt, həftə, hər zaman, hər ay qucağında
Doyunca yuxlayıb ta ki deyək oxqay qucağında.

*Kefsiz*

## ELAN

***Nuxadan***

Əvvəlinici Cümə məscidinin müəzzini Bığ Abdulla əzan vaxtında çayxanalarda qumar oynamağa məşğul olmağına görə vaxtında əzan deməyə gələ bilmir. Buna görə oxuculardan artıq təvəqqe edirəm ki, hər kəs bir bikar müəzzin yeri bilirsə, bizə xəbər versin. Bu şərtlə ki, qeyri vaxtlarda hər nə eləsə bizə borc deyil, amma vaxtlı-vaxtında əzanını desin ki, xalq namazın vaxtını keçirməsin.

***Adres böylə:***
***Nuxa, əvvəlinci Cümə məscidinin imamı.***

## ARVAD MOLLASI

Mən baxıb görürəm biz müsəlmanlardan başqa yer üzündə rus, firəng, gürcü, erməni, yəhudi, nəsara və qeyriləri var, görəsən onların da arvat keşişləri var, ya ki yoxdu, hərgah yoxsa bəs qiyamət günü onların arvadları kimin ətəyinin ucundan tutub qıl körpünün üstündən keçəcəklər, hərgah yoxsa vay onların halına.

*İmza: Məşədi Mir Ruqiyyə mollabacı*

## MƏŞƏR

İstəyirsən ki, a Molla! Sənə timsal yazım
İştə çap eyləgilən bir neçə əhval yazım
Bir neçə surəti-sima ilə əşkal yazım
Rövzəxan, seyyid, dərvişlə nəqqal yazım
Başı sarıqlı ayı, bambılı rəmmal yazım
Məşədi tülkü, neçə kablayı çaqqal yazım
Xər mürid, şeyx öküz, həm də hacı kal yazım
Taciri, çayçını, qəssabla baqqal yazım
Zöhd-təqvaliyə ki qırmızısaqqal yazım
Müxtəsər xanı, bəyi, kəndçi və həmmal yazım.

Cümlə dindarlarım qoy mənə nifrət eləsin
Quba əhli ilə molla yava lənət eləsin
Bakılılar mənə təhdid və əziyyət eləsin
İstəməm Lənkəran əhli mənə hörmət eləsin
Əhli-Səlyan, Dağıstan da şəmatət eləsin
Gilay etsin şəkililər hamı heyrət eləsin
Əhli-Şirvan nə utansın nə də qeyrət eləsin
Qarabağ əhli sənə söyməyə adət eləsin
Əhli Dərbənd hamısı qoy bizə töhmət eləsin
Xəbər et qorxsan əgər, bir bala ehmal yazım

Yazıram Hacıqabul, Qalaqayın, Ağdaşdan
Kürdəmirdən, Şamaxıdan, neçə hamı başdan
Gəncə, Şəmkir, Dəlilərdən neçə din qardaşdan
Vadiyi cəhli-Zəgəmdən, sarı, göy, ağ başdan
Ta Qazaxda, Qarayazda tökülən qan yaşdan
Həm də Tiflisdə olan bir neçə kordan, çaşdan
Gümrü, Karsdan, İrəvan qəlbləri bərk daşdan
Naxçıvan, Ordubad içrə dolanan fərraşdan
Şəhri-Batumda, Kutaisdə olan göz-qaşdan
Buraxıb bunları mən ta necə timsal yazım.

Söyləyim Molla dayı! Əvvəla bu Yevlaxdan
Ta ki Yevlaxda olan bir neçə pis axmaqdan
Saniyə vəqtləri yox qumara baxmaqdan
Dindirəndə danışırlar bıçağı soxmaqdan
Mollası vəz eləyir saqqala rəng yaxmaqdan
Hacısı on iki sinnində qızı almaqdan
Məşhədi, kablayı barmağa üzük taxmaqdan
İştə Yevlax ibarətdi neçə axmaqdan
İndi çap eyləgilən bir neçə əhval yazım.

Molla Nəsrəddinə, bəli özləri nifrətlə baxır
Leyk içməkdədilər şam-səhər içki-çaxır.
Oxusa kim qəzeti kafir edir molla paxır
Bir uşaq görsə ki, ağzından o dəmdə su axır
Ucuz ağlatmağını həftədə bir başa qaxır
Səslənən dəmdə dolur xalxala bir dəstə naxır
Hamısı gövşəmədə, kişnəmədə mat baxır
İbtida moizə saqqala həna rəng yaxır
Ağladır yaxşıca gör göz yaşı sellərcə axır
İndi can eyləginən cürbəcür əşkal yazım.

*(dalısı olacaq)*

*Herik Kabla Səkinənin əri: Bambılı*

## ALLAH LƏNƏT ELƏSİN!

Dünyada və axirətdə layiqi-lənət olanların adlarını mən bir-bir söyləyim, sən də amin de.

Allah şagirdlərin hissiyatını oyadan müəllimlərə lənət eləsin… amin!

Allah mollalarımızın eyiblərini açan adamlara lənət eləsin... amin!

Allah camaatı qəflətdən oyadan və öz hüquqlarını özlərinə qandıranlara lənət eləsin… amin!

Allah bu milləti cəhalətdən qurtaranlara lənət eləsin… amin!

Allah teatr səhnəsində oynayan məlunlara lənət eləsin… amin!

Gözə görünməyən allaha and verirəm yüz arvadlı və beş yüz siğəli müqəddəslərimizə və qazi Cəfər dayının millət yolunda etdiyi xidmətlərinə, Kabla Həsən əminin palanduz sünbəsinə və Hacı Qır-Qır əminin Məkkədə atdığı "rəmül-cümrə" daşına, arvadlar hüququnun tərəfdarı olanlara yekə-yekə lənət eləsin…

Amin, amin, səd amin!

*Pirverdi*

## SUALLAR

Gəncə gimnaziyasının müəllimüş-şər’iyyələri maarifpərvərlərə lənət oxumaqda mahirdirlər, ya Şamaxıda realni məktəbin şagirdləri sinəzən oxumaqda?..

Ağasının yolunda bir qətrə göz yaşı cari edən şiə tez behiştə gedəcək, ya Nuxada qız məktəbinin binasını xarab edənlər?

## BOĞANAQ

*Əsdi tozlu şimaldan bir yel*
*Oldu qasırğa, oynadı tufan*
*Yıldırım çaxdı bərk, qaynadı sel*
*Qərqi-xun oldu zövrəqi-İran*
*Tələfat oldu çox, ziyan külli*
*Qaldı sağlam bina, nə bir tikili*
*Demə bu böylə, o niyə elədir*
*Sirrdir, bəlkə məsləhət belədir.*

*Girdbad*

## HARAY

"Ay haray, din əldən getdi. Biz deyərdik ki, uşkol açıldı, çocuqlarımız rusca oxuyub dindən dönəcəklər, indi başımıza gələnə baxın: gecə məktəbi açılıb, böyüklərimiz də rusca oxuyub dini əldən buraxdılar. Ay aman biz kimə şikayət edək?"

***İmza: İlisuda uşkol istəməyin köhnə tərəfdarları***

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## "HAQQ YOLU"

namində həftəlik ictimai, siyasi, elmi, fənni, ədəbi və məxsusi ehtiyacati-islamiyyədən bahis türk lisanında məcmuə nəşr edilir.

*Abunə ücrəti:* Bakıda illiyi 3 manat 50 qəpik
Yarım illik 2 manat
Sair şəhərlərə illik 4 manat
Yarım illik 2 manat yarım

*Ünvan:* **Bakı, Olginski küçədə, bələdiyyənin yeni evində. Müdir və sərmühərrir: doktor Qarabəy Qarabəyov**



## "YENİ İRŞAD"

**Abunə qiyməti bu qərar ilədir:**

Bakıda və Rusiyanın sair şəhərlərində:
İlliyi, altı aylığı, üç aylığı, bir aylığı
On manat, altı manat, üç manat, bir manat
Məmaliki-əcnəbiyyədə:
İlliyi, altı aylığı, üç aylığı, bir aylığı
14 manat, 8 manat 50 qəpik, 4 manat 50 qəpik, bir manat 50 qəpik

Qeyd: 1912-ci il üçün birdəfəlik 10 manat abunə pulu verən müştərilərə nəşr etdiyimiz böyük islam təqvimindən bir nüsxə göndəriləcək.

Məsciddə



Vaqeən, gözəl mərsiyəxandır, qabaqca camaatı çox güldürürdü



*Deyirlər, təzə mərsiyəxan gəlib, çox tərifləyirlər.*



Axırda da Mirzə Hüseyn çıxdı minbərə və başladı nə bilim millətdən, elmdən və tərəqqidən danışmağa.




sonra da yaxşıca ağlatdı.

ملا نصرالدين

№4 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 4




Litoq. S.Bıxova.

*Fotoqrafiyamızı göndәrәcәyik Yaponiyada tәzә müsәlman olan baron «Heygi»yә.*

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində:12 ay--altı manat.
6 ay.........................................3 manat yarım.
3 ay.........................................2 manat.
Kasıblara.................................12 ay--5 manat.
*6 ay.........................................3 manat.*
3 ay.........................................1manat 60 qəpik.
1 ay.........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay.......................................7 manat.
6 ay.........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə.........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*20 səfər 1330* Hər həftə nəşr olunur *27 yanvar 1912*


## TÖK

Tök, mən ölüm tök, şəriət sahibinə qurban olum: namazımı öz vaxtında qılıram, orucumu tuturam; bu bir stəkan çaxırı da əlbəttə Allah mənə bağışlar, günah yazmaz. Götür, götür istəkanı, sağ ol, içirəm sənin sağlığına.

Atam və anam sitayiş etdiyi dini mən də müqəddəs tuturam və arzu edirəm ki, cəmi müsəlman qardaşlarım Allah təala göstərdiyi yol ilə gedib müsəlmançılıqda bərqərar olsunlar.

Amma bunilə bərabər piş əzvəqt cəmaətimizin tərəfindən üzr istəyirəm və şəriət sahibinə iltica edirəm ki, bir para ümmətlərinin günahından keçib qeyri mömün qardaşlara bağışlasın.

Ərzim burasındadır ki, şəriətimizin çaxır içməyi həram buyuran hökmünə müsəlman qardaşlarımın bir paralarının tabı yoxdur, həqiqət, yazıqların tabü təvanası yoxdur. Hər nə deyirsən de: orucu deyirsən - tutsun, namazı sən 17 rükət deyirsən - yüz on yeddi rükət qılsın, Kərbəla ziyarətinə bir dəfə deyirsən - on üç dəfə getsin, hələ istəyirsən Məşhədə də getsin - amma demə içki içmə.

Bu xüsusda mənim üzrüm, əvvəla, bir para əsnaflar və kərbəlayı və məşədilər tərəfindəndir. Saniyən rus dərslərini yarı yolda qoyan təzə cavanlar tərəfindəndir və salisən, bəy və xanlar, əyanlar tərəfindəndir.

Bizim Qafqaz şəhərində meyxanələr var, küçə ilə keçəndə görürsən ki, bir rus ya erməni ağzını göyə qalxızıb rumkanı çəkir başına. Amma sən bilmirsən ki, o meyxanənin içəri tərəfində bir qaranlıq yer var ki, orada üç-dörd məşədi gizlənib içməyə məşğuldurlar. Tök, götür, götür istəkanı, mən ölüm götür, ya Allah, sağ olsun Məşədi Hüseyn. Bunu içirəm Məşədi Əlinin sağlığına. Sağ ol, Məşədi Məhəmməd, sağ ol. İçirəm dostların sağlığına.

O ki on beşdən başlamış iyirmi bir yaşa çatan dərsləri yarımçıq xanzadə və bəyzadələrdir - Allah bunlara insaf versin, nə yol tanıyırlar, nə iz tanıyırlar, nə Allahdan xəbərləri var, nə bəndədən. Gecə-gündüz əlləri xəncərlərinin qınında, ya papaqları yanqılıcı, kefli-kefli dolanmaqdadırlar. Bunlar ilə mənim işim yoxdur, belə-belə, veyl-veyl gəzən və içki içməyi özləri üçün şöhrət bilən cavanlar ilə Molla Nəsrəddinin işi yoxdur, amma otuz beşdən başlamış əlli beş ya bəlkə altmış yaşındakı üzüqırxıq bəy və xanlarımız tərəfindən yenə mən üzr istəyirəm, bir surətdə ki, tərki-adət bə mövcibi-mərəzdir, bir surətdə ki bu yazıqlar ömrlərinin əvvəllərindən özləri hərçənd bisavad olublar, amma həmişə böyük adamlar ilə oturub durublar. Məsələn, pristavlar ilə, naçalniklər ilə, uryadniklər ilə, bəlkə strajniklər ilə və bir surətdə ki, bu qədər böyük adamların yanında mən özümü çaxırı həram bilən avam müsəlmana oxşadım, onda bəs mənə nə deyərlər? Məgər mənə deməzlərmi ki: "bax gör necə fanatik müsəlmandır". Xeyr belə şey ola bilməz, bəlkə mən özüm də elə bilirəm ki, içki içmək haramdır, bədənə də, cibinə də və abruyə də zərəri var, lakin ayıb deyilmi ki, bəy ola-ola, özümü avam müsəlmana oxşadam, onda dəxi Kərbəlayi Zülfüqar ilə mənim nə təfavütüm? O çaxır içmir, mən də içməsəm ona oxşuyacağam. Ədə,

get bazara! Üçüncü nömür Kaxet çaxırı gətir! Yarım düjin ağından, yarım düjin qırmızısından! Qayıdıb gələndə Səfər bəyə de ki, nahara gözləyirəm, Xəlil bəy də bizə gələcək. Tez ol! Aç butulkanı! Tök, bura da tök! Götür, Xəlil bəy! Bu istəkan sənindi.

Həsən bəy! Sənə hansından töküm? Ağından, qırmızısından? Mən ölüm götür, götür, sən Allah naz eləmə, mən ölüm! Ya Allah, sağ ol, sağ ol! Əmoğlu! Sənin sağlığına! Pəh, pəh, pəh, pəh tünd araqdır ədə! Bu zəhərmarı hardan gətirdin? Bu birini aç! Tök, tök, Həsən bəy, sən öləsən olmaz, hamısını gərək içəsən, əla ya əyyühəssaqi, əsbi-lağır miyan bekar ayəd, əmoğlu, tök, tök, bax, bu dördüncü rumkadır ki mən içirəm. Amma siz ikisini də içməmisiniz. A kişi, cəhənnəm ol ta içmirəm. Sən öləsən, namazımın vaxtı keçir. Ay sən öləsən həyə namaz qılırsan, vallah, camaatın üzünə qılırsan.

Tök, tök, götür. Məhəmməd bəy, içirəm dostların və dostluq qədiri bilənlərin sağlığına! Sağ ol, sağ ol, götür, götür, sən öləsən olmaz, axıra kimi, axıra kimi.

Əmoğlu, gəl öpüşək.

Yox, yox, ədə, ağzından nə qoxusu gəlir? Deyəsən sarımsax yemişəm.

Yox, zəhirmar, itil cəhənnəmə!

Əla ya əyyühəssaqi...

*Molla Nəsrəddin*

## TAZİYANƏ

*Özgələr viranədən gənc axtarır*
*Vüsəti-otaq üçün rənc axtarır*
*Bizlərin də cümlə sərcünbanımız*
*Minbər üstə naz ilə ğunc axtarır*
*Başda əmmamə əsa badami təlx*
*Dördə də razı deyil, pənc axtarır.*

*Qotur keçi.*

## ORENBURQ XƏBƏRLƏRİ

Kəndinə "Tatarski Şalyapin" ismini taqmış... əfəndi iki dəfə konsert verib əhalinin afərin və altun saətlərinə nail olmuş isə də, belə ufaq şeylərə qənaət hasil etmədi; Uralın altun dağlarına əl uzatmaq istəyirsə də nə çarə, Süleymanın "Süleyman peyğəmbər" üzüyü əlindən ğaib olduğundan, məqsədinə irişməsi şübhəlidir.

Dəri pazar tatarları imanlarını təzə qılıb, şimdi cümə günü bayram yapa başladılar.

"Cəmiyyəti-xeyriyyə"nin bəzi kapusta qafalı əzaları bütün ətrafda olan molla və müəzzinləri fəxri əza təyin etməsi üçün, cəmiyyətə ərzi-hal vermişsələr də, cəmiyyət belə divanələr fikrini rədd etmişdir.

## BOŞLA YAXUD ƏLDƏN QOY

*Boşla, məşrutə nədir, ay bala iranlı nədir*
*At kənara belə sözlər nə, xorasanlı nədir*
*Nədi hürriyyət, əhərli nədi, kaşanlı nədir*
*Nədi məslək, nədi təbrizli, damqanlı nədir*
*Hiss, birlik və siyasət nədi, tehranlı nədir.*

*Altı min ildi ki, İranda bu sözlər yox idi*
*İstirahət var idi, qarğaşa yox, şər yox idi*
*Yoxsa iranlıda ol vəqt beyin, sər yox idi.*
*Bilmiyirdi ki, izzətli nədir, şanlı nədir*
*Boşla, məşrutə nədir, ay bala iranlı nədir.*

*Varmı bir ölkə həmin kişvəri-naçiz kimi*
*Hanı bir şəhr cahanda belə Təbriz kimi*
*Bavəfa xəlqi, qaranlıq üzü dəhliz kimi*
*Başa baş boşla həp iranlı nə, məşrutə nədir*
*Götür at, çirkli keçəl baş nədi, ağ futə nədir.*

*Var bir iranlıda, təbrizlidə üç-dörd məslək*
*İki yüz məkr, fırıldaq, iki min hiylə, kələk*
*Vurdurur başına hər gün iki yüz min dəyənək*
*Çıxır ortalığa hər həftə başı qanlı nədir*
*Qanmıram mən, edirəm fikr işi həryanlı nədir.*

*İçlərində gəhi Hac Mirza Həsənlər qovulur*
*Ehtiram ilə gəhi içlərinə daxil olur*
*Düzəlir gah nizamın teli, gahi pozulur*
*Gah londonlu olurlar gəhi səlyanlı nədir*
*Əncümənli gəhi, gahi də Səmədxanlı nədir.*

*Görür əhvalı pərişan bu cürə Məmmədəli*
*Acığından qalır az ölsün o biçarə dəli*
*Bir bəyannamə yazıbdır ki, onun yox bədəli*
*Deyir onda: ki onu mindirələr təxtə genə*
*Bəxt ta onlara, onlar da gülə bəxtə genə.*

*Var ümidim o kişi bir də bu mülkə ola şah*
*Ola asudə vətən, dincələ ta xəlqüllah*
*Baisin yıxsın evin, yıxdı necə ki Allah*
*Əncümən xəlqi dağıtdı, gədəli xanlı nədir*
*Oldu puç el hamı, şirazlı nə, zənganlı nədir*
*Boşla, məşrutə nədir, ay bala iranlı nədir.*

*Kefsiz*

## SU MURDARLIQ GÖTÜRMƏZ

Deyirəm Molla dayı, bu uruslar necə avamdırlar: peşiman olub bizim Şəkidə adam naxoşlar. Cəld yügürüb hamamlarımızın xəzinələrini bağlarlar ki, naxoşluq guya hamam xəzinələrindən çıxır.



*Mərsiyəxanı*

*Hansı müsafiri kim qəbul edir.* *Кого кто назначоет.*



*Pristavı*



*Bank məmurunu*

*Hansı müsafiri kim qəbul edir.* *Кого кто назначает.*



*Yazıçını*

**Bu** ildə goburnat dəftərxanasından hökm çıxıb ki, Qurcan çayından çıxan beş-altı yüz bulaqları gərək təmiz saxlayasınız. Və buna da sarsaq-marsaq səbəblər göstərilib: nə bilim, bulaqların başında papaqçılar həmişə növbət ilə minə qədər dəri iki-üç gün islanmağa qoyub, sonra da yuyurlar və bu iylənmiş dərilərdən axıb bulaqlara qarışan peyinli, qanlı sular kənarda dursun, dərilərdə əmələ gələn mikroblar da sulara qarışıb iyirmi-otuz min camaatın qarnına doluşurlar və cürbəcür naxoşluqlar törədirlər. Nə bilim, çayın başına, ayıb olmasın yuxarı yaşlılar istibrayə gedirlər. Nə bilim bulaqlar keçən məhəllələrin hərəsində iki su gözü deşilir ki, birindən məhəllə sahibləri su alıb işlətsinlər və o birinin ətrafına qəza hacəti üçün getsinlər ya paltar və qab suyu boşaltsınlar. Və bunu da axtarıblar ki, şəhər təmizliyi upravanın borcudur (guya uprava öz borcunu başa düşmür). Hərgah uprava su işini öz ixtiyarına alsa, təzə lülələr çəkib baxıcı təyin eləsə, Şəkidə naxoşluq olmaz. Mən ölüm Molla dayı, bir qanmazlığa bax! Hamamçı müsəlman, çimən müsəlman, papaqçı müsəlman, ... müsəlman, içən müsəlman və müsəlman olan kəs də bilir ki, su murdarlıq götürməz, xüsusən axar su ola. Yəni bir yerdə qərar tapıb dayanan su da murdar olmaz ta üç xasiyyət onda tapılmasa, bu da ki: rəngdir, iydir və daddır. Və çünki şəhər upravası da Allaha min kərə şükür olsun ki, müsəlmanlardandır və bilirlər ki, hamam xəzinələri bağlansa, qüsl eləməyə yer tapılmaz və sonra murdarlıq götürməz, buna görə qərar qoydular ki, qanmaz uruslara cavab versinlər ki, şəhərin yolu yoxdur.

*Dayının bacısı oğlu*

## BALACA FELYETON

### DÜBBƏ

Rəhmətlik Nəsrəddin şah qətlə yetişməmişdən qabaq Təbrizdə bir "Şəbnameyi-bəsirət" çıxartdırdılar və orda şah üçün bir təlqin yazıb, cəmi nameyi-əmalın bir-bir üzünə oxumsuşdular. Guya şaha belə təlqin eləmişdilər ki: "Zəmani ki sənin ruhun cəsədindən pərvaz etdi və səni qoydular qəbrə, onda inkir-minkir gəlib sənin Allahından, peyğəmbərindən, qibləndən, kitabından, məmləkətindən, səltənətindən, əmarından, təxribindən soruşacaq və sənin qanunundan, qoşunundan, nizamından sual edəcək, qorxma ey filan-filan olmuş, degilən: bədürüsti ki yuxu mənim allahımdır, qəflət peyğəmbərimdir, as kitabımdır, övrətlər qibləmdir, hərc-mərc qanunumdur, tuzlar sərtiblərimdir, dağların kəlləsi yolumdur, livan govduşi mətaımdır və əhləldübbə mənim diplomatımdır və ilx".

Mənim başqa işlər ilə işim yoxdur, fəqət mən bunu danışacağam ki, gərək aya dübbə deyilən nə olan şeydir ki, ona şahın diplomatı deyilmişdir? Yəni külli məmləkətin politikasını və siyasətini bilən deməkdir.

İştə həmin suala cavab:

Hər kəs bilmirsə bilsin ki, İranda şahdan, vəzirdən, şahzadədən, əmirdən tutmuş yerdə qalan xırım-xırda tacirlərə və əyanlara kimi hamısının yanında, dərxanəsində işin ağası, qəlyan, çubuq dolduran, məvalə aftaba aparan, nökər, nayib, mehtər, kalikəçi, abdarçı, qatırçı, miraxur, pişxidmət, qapıçıdan başqa bir nəfər müftəxor adam olar ki, əlin ağdan qaraya vurmayıb düz-düz yeyib, içib yatar və ağa hər yana getsə yanınca dolanar, hərəmxanaya - filana hər yerə təraddüdü olar və ağaya hamıdan artıq müqərrəb və məhrəm olar. Bu adama deyərlər təlxək, yainki dübbə. Yəni nə vaxt ki, ağa hər bir əmaldan fariğ oldu, başlar bununla mazaxlaşmağa: bunu döyər, incidər, acıdar. Bu da başlar ağaya yaxşı ərəzi yamanlar deməyə və ağanın atasın, anasın, arvadın, uşağın bir-bir pis-pis söyüşlər ilə söyməyə və bu olar ağa üçün bir təfrih, bir eyş.

Mərhum Nəsrəddin şah və Müzəffərəddin şah ki neçə dəfələr Firəngistana səfər ediblər, bir dəfə olmayıbdır ki, yanlarınca mərsiyəxandan, yuxu təbir edəndən, dərvişdən, seyiddən, taleə baxandan əlavə belə bir dübbəçi aparmamış olsunlar, ondan ötrü ki, rəhmətliklər ya İranda, ya xaricdə bir dəqiqə belə mətəlçisiz və təlxəksiz ömür keçirə bilməzdilər, çünki əhli-zövq idilər.

Mən xırda vaxtlarımda ki Təbrizə gedirdim, həmişə görərdim ki, bir qonaqlıqda ya toyda və ya təziyədə camaat durhadur əyləşib və bir nəfər boynuyoğun da oturub yuxarıda hey cəfəng-cəfəng (Çakər danışan sözlərdən) danışır və bunlar da əl-ələ çalıb qah-qah çəkirlər. Mən soruşardım ki: o kişi kimdir və nə deyir və niyə bu adamlar belə gülüşürlər? Cavab verirdilər ki: "dinmə o dübbədi, bunlar onu kökəldirlər, təfrih edirlər". Və gah olardı görərdim ki, bu kişini bazarda hoyda-hoydaya götürüb (necə ki İranda kürd çarsıya girəndə hamı bazar adamı alverindən əl çəkib doluşardılar onun başına, onu ələ salarlar) hara gedirsə gedirlər, durur dururlar və o yazıq da mat məbhut qalıb bilmir nə eləsin. Deyərdim ki, bu biçarəni niyə belə gic edib dolandırırlar? Cavab verirdilər ki: "O kişi qəribədi, şəhərə nabələddi, bu adamlar da dübbədi, onu beləcə səriyiblər". Ələlxüsus məscidlərdə: birdən görürdüm ki, məsələn, minbərdən şirin danışdığı yerdə birdən beş-on adam durdular ayağa və əllərin qulaqlarına qoyub başladılar bir-birinin dalınca igirmi-otuz dəfə salavat çövürməyə və axund pərt olub yendi aşağa, istəyir getsin, başmaqlarını tapa bilmir. Soruşanda ki: bunlar niyə Allahın məscidində belə biehtiramlıq və bihəyalıq edirlər? Deyərdilər: "Bunlar dübbədi, mollanı səriyib qızışdırırlar kef çəkirlər, bunlar hər məscidə getsələr belə edirlər".

*(Axırı var)*

*Cüvəllağı bəy*

## XAÇIN KƏRAMƏTİ

Xaç suya düşən günü idi. Zəng partapart vururlurdu. Bir qədər gələn-gedənə tamaşa edib gördüm ki, müsəlman arvadları kimisi uşağı dalına səriyib, kimisi yanınca sürüyə-sürüyə erməni kilsəsinə tərəf gedirlər. Mən də bunların dalınca getdim görüm ki, burda nə bir iş var ki, arvadlarımız belə tələsik gedirlər. Xülasə, keşiş xaçı sudan çıxardıb dübarə kilsəyə girdi. Bu dəmdə onu gördüm ki, müsəlman övrətləri erməniləri basa-basa dolurlar kilsənin içinə, mən uzaqdan ancaq bu sözləri eşidə bilirdim: "Ay keşiş ağa! O xaçı bu gəlinin də başına qoy və xaçın suyundan da tök". Mən bu işə çox təəccüb elədim ki, pərvərdigara, görəsən bu xaçda nə kəramət və nə sirr var? Bayıra çıxan arvadların birisindən soruşdum ki: ay xala! Xaçı niyə başınıza qoydurub su tökdürdünüz? Arvad dedi ki: "Hansı doğmuyan arvadın başına xaçın suyundan tökülsə, haman dəqiqədəcə uşağa qalar". Dedim: ay xala, belə şey ola bilməz. Arvad mənə dedi ki: "Siz kişilərin etiqadı həmişə süst olar, biz bu işi təcrübə eləmişik, hətta dünən Yasdaq xanım and içirdi ki, oğlu Cabbarı başına su tökəndə doğub".

İndi deyirəm, Molla əmi! Bu xaçpərəst tayfası necə gic tayfadır ki, bu vaxtacan xaçda olan kəraməti bilməyiblər. Genə şükr olsun bizim arvadlara ki, elmləri, dərsləri olmaya-olmaya elə şeylər tapırlar ki, hərgah xaçpərəst yüz il də fikir eləsə belə şeylər tapa bilməz.

*Səfeh şamaxılı*

## DƏRDİM TƏZƏLƏNDİ

Genə ay Molla əmi! Bu günləri mənim dərdim lap təzələndi, çünki bu qəzetçilər bizə bihümmət deyə-deyə bizləri lap biqeyrətlik basdı, neçə vaxtdır səbr edirəm, baxıram heç sizə bir layiqli cavab verən yoxdur. İndi mən deyim sən qulaq as: söz yox, hacı Novruzəli bəy də başmaq üstündə on beş yaşında igid oğlana havadar çıxanlar və dava eyləyənlər hümmət etmədilər, çünki xəncərləri çəkdilər, amma bir-birlərini feyzişəhadətə yetirmədilər. Bir də təpə başı məclisində bir ağa bəzzaz ilə bir əyan bəzzazın təəssüb davaları düşmüşdü ki, bunlar da tapançanı zadı çıxartdılar, atmadılar. Amma İrəvan sinəzən dəstələrinin dəstəbaşıları hamısı hümmətli və igid oğlanlar idi. Kimin nə cürəti var idi ki, olar gələn bilandan tək gedə bilə. Bəlkə döyə-döyə sinəzən eylərlər. Hacı mollanın zadəsi Məşədi Əli ləngərdə lal igitdir, çünki həm dəstəbaşıdır, həm də sinəvuran. Onun sinəsinin səsi hamını basmasa kar deyil. Daha bundan da yekə hümmət? Bu da qəzetçilərin cavabı!

*Noxtasız*

## POÇTA QUTUSU

Culfada bir nəfər təzə şairə: "Əliqulu" imzalı yazdığınız savadsız şeirlər ilə bir nəfər ordubadlını pisləyirsiniz ki, bangda uçotnı çlen olub ordubadlılara xod vermir. Dəxi bundan savayı bir söz yaza bilmənik.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*



Qəzet
Чтение газеты.



- A kişi, nə fikir eləyirsən?
- Onu fikir eləyirəm ki, bilmirəm əvvəl hara gedim: hacı Rüstəmin qabağına, yainki hacı Əli Əkbərgilə ehsana.

ملّا نصر الدّين

**№5 Qiymәti 12 qәpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 5**



**ABUNƏ QİYMƏTİ**

| | |
|---|---|
| Qafqazda və Rusiya daxilində: | 12 ay--altı manat. |
| 6 ay | 3 manat yarım. |
| 3 ay | 2 manat. |
| Kasıblara | 12 ay--5 manat. |
| *6 ay* | *3 manat.* |
| 3 ay | 1manat 60 qəpik. |
| 1 ay | 40 qəpik. |
| Əcnəbi məmləkətlərə | |
| 12 ay | 7 manat. |
| 6 ay | 4 manat. |
| Nüsxəsi idarəmizdə | 10 qəpik. |
| özgə şəhərlərdə | 12 qəpik. |

## Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*29 səfər 1330* Hər həftə nəşr olunur *5 fevral 1912*

**MÜƏLLİM VƏ MÜƏLLİMƏLƏRİMİZ DİQQƏTİNƏ**

Üsuli-təlim və tərbiyədən fənn-tədris əsəri-əbdahşünasi.

İqtidarlı müəllimlərimizdən Əbdah əfəndi Şünasi cənabları təlif etgan bu kitab, tez gündə "Vəqt" idarəsi tərəfindən nəşr etiləcəkdir.

Kitabın Avropada məqbul, en yaqşı oku üsulları tərif etilgan. Təlim və tədrisdə əsaslı və dürüst yol görsətilgan. Əlifbadan başlab qiraət, yazu, imla, ana tili və onun sərf və nəhvi və inşası, Qurani-kərim, ülumi-diniyyə, coğrafiya, tarix, hesab və həndəsə, məlumati-fənniyyə, məlumati-əxlaqiyyə və mədəniyyə kibin fənnlərinin hər qayusinin ayrım-ayrım üsuli-tədrisləri təfsilli və mühakiməli rəvişdə bəyan etilgan.

Üsuli-təlimgə müvafiq itüb oxutlığan dərslərdən nümunələr qoyulğan. Cəza və mükafat ilə müəllimlərinin vəzaifi turusunda məlumat berilgan.

Hazırki, darülmüəlliminlərimiz yox bulğan bir zamanda bu kitabın bir dərəcə mənəvi darülmüəllimin xidmətin ifa etəcəyi məmuldur.

Kitab orta qolda yüz əlli beytlər zorluğunda bulacaq. Bahası idarədə 35 tiyin, poçta ilə 45 tiyin. Müraciət üçün adres:

*Г. Оренбург, контора редакция газеты " В а к т ъ ".*

**İMTAHAN**

Axır vaxtlarda genə bu cür söhbətlər tez-tez aralığa qoyulur ki, Qafqazda bir mədrəseyi-ruhaniyyə açmaq lazımdır ki, oradan oxuyub qurtaran mollalar Avropa elmlərindən bir növ xəbərdar olsunlar və bu cür mədrəsəni müsəlman camaatı üçün mənfəətli qələmə verirlər və bu cür sözləri də danışanlar özlərini müsəlmanların xeyirxahlarına oxşatmaq istəyirlər.

Əgər biz bu əmrə etiqad eləsək, əgər biz bunu təsdiq eləsək ki, Qafqaz mollalarımız bir əlahiddə mədrəsəyə möhtacdırlar, onda gərək biz bunu da boynumuza alaq ki, guya xudanəkərdə, belə məktəb qurtarmayan ruhanilərimiz naqisdirlər.

Vallah, adamı qoymurlar ki, dinməz söyləməz oturub işinə məşğul olsun.

Mən müxtəsərcə burada bir söz ərz eləyim, əgər insaf əhlisən, deyəcəksən: "Belədir, Molla Nəsrəddin, sözün haqdır". Əgər insaf əhli deyilsən, di qoy get işinə.

Mədrəsələr dünyada ondan ötrü qoyulublar ki, orada təhsil tapanlar oxuyub yazmaq öyrənsinlər.

Bu bir aşikar mətləbdir ki, mollalara bir o qədər oxumaq və yazmaq lazım olmur. Çox yazmaq qəzetçi peşəsidir. Çox kitab oxumaq bikar advokatların və dərin həkimlərin sənətidir. O ki mollalarımızdır, bunların yazdıqları həftədə bir dəfə müxtəsər bir kəbin kağızı ya talaq kağızı yazmaqdır. Əgər prixod mollasıdır, metrik dəftərinə səfər ayının dördündə anadan olan Sadığın adını yazmaq, atası Məşədi Hüseynin adını və anası Kəblə Fatmanın adını yazmaqdır, filan və filan, vəssalam, qurtardı getdi.

Bundan ötrü mədrəsə açmağın mənasını dəxi mən bilmirəm.

Bundan savayı hələ bir mətləb də var:

Mədrəsə, nə bilim darülfünun – bunlar hamısı şöhrətdir. Elm, nə bilim fənn, nə bilim maarif, təməddün – bunlar əvari zatdır. İnsanda gərəkdir bəxt olsun, bəxt, bəxt!

Burada sənə ikicə dəlil gətirib sözümü qurtarım: əvvəl götürək Nuxada Axund Molla Sibqəti: hansı mədrəsədə təhsil tapıb?

Heç bir yanda, amma bəxtinə bax ki, həmi məktəb naziridir, həmi müəllimdir, həmi axunddur, həmi mərsiyəxandır,

qədr-qiyməti də o dərəcədədir ki, Məşədi Əlibala Hacı Nəcəf oğlunun təziyəsində ev sahibi götürüb buna üç manat mərsiyə pulu, bir manat xətmi-Quran və bir manat da mollalıq pulu verəndə, axund bu pulların 2 manatını sahibinə qaytarıb, üç manatını da utana-utana qəbul edir. Bu nədir, məhz xoşbəxtlik. Çünki cəmi cavanmərdlər, səxavət və şücaət sahibləri ali vücuddurlar, yəni xoş səadətdirlər.

İkinci dəlilim sənə mübarək Sabunçu ruhanisinin macərasıdır ki, bu zat on sənədən ziyadədir ki, mollalığa intixab edilmişdir. Lakin mollalığa təsdiq olunmaq üçün imtahan verməsi lazım idi. Amma özünün elm və məlumatı fövqaladə olduğu üçün imtahanı özünə layiq bilmirdi. Amma indi təsdiq olundu. Bəli, təsdiq olundu, hı, bəli, bəxt, bəxt, bəxt, bəxt. Mənim də bəxtim olsaydı, iki nəfər güclü və pullu adam gedib qazi yanında vəsatət eylərdi ki, bəli, filan... o söz, arifsən həyə annarsan. Və əgər istəsəniz bu zatın savadının dərəcəsini biləsiniz, bir nəfər Sabunçu silisçi sudyasına yazdığı kağızı eynən burada çap edim ki, siz də oxuyun və görün ki, hər bir şey dünyada qabiliyyətnəndir, Allah vergisidir, mədrəsə filan lazım deyil:

"Cənab müstətab mollayi-Əbdülcabbar silisçi sudi-Sabunçi dami-iqbalə təvəqqə və xahiş olunur cənabından bir vərəqi dəftəri mədrəseyi-təməddün hesabi-odun yazıb irsal edəsiz rəf xanə bir sacın odun mədrəsə üçün Mir Ağa Seyid Musa oğlu alıb fisacın 46 manat yanvarın 16-da təfil vermişəm müdərrisi müdirə və xadimə baqi 1912, 21 yanvar və şişə mədrəsə 5 ədəd 1b."

Bu da təsdiq olunmuş ruhanilərimizin qələmlərinin əsəri.

Dəxi bil ki, mədrəsə, filan artıq işdir. İnsanda istedad lazımdır, yəni zehin və qabiliyyət, şüur və dərrakə lazım, yoxsa mədrəsə zad artıq işdir.

*Molla Nəsrəddin*

## BAKI MÜXBİRİMİZDƏN TELEFON İLƏ

Bu gün səhər poezdi ilə osmanlıdan naloj vasitəsilə göndərilən "köhnə ədəbiyyatı" Bakı yazıçılarından bir paraları təhvil aldılar, sabah bölüşəcəklər.

Bakının dünənki şiddətli küləyi, bakılıların evlərindən kənar yerdə saxladıqları məhbubələrin yanına getməyə mane oldu.

Bakılılar qərar qoydular ki, bundan sonra kart oynayanda "yandı naxış" oyununun əvəzinə özgə bir oyun oynasınlar.

Bakı mühərrirləri and içdilər ki, bundan belə qəliz ibarələr işlətməsinlər.

Quba meydanının ticarəti bu günlər artıq tənəzzül etməyindən paytaxt qəzetləri bu işə artıq diqqət yetirməkdədirlər. Bu iş Yevropanın məhafili-siyasilərini böyük əndişəyə salmışdır.

Dünən gecə Bakı dövlətliləri "Nəşri-maarif" cəmiyyəti əzalarını kəndlərdə məktəblər açdıqlarına görə "Kazino" restoranında əzaların sağlığına on yeddi min manatlıq içki məsrəf elədilər.

*Təzə Dəmdəməki*

## SAQİNAMƏ

Gətir bu məclisə saqi şərab-vodkanı
Apar buraya gözüm ta ki bir görüm anı

Şərab ruhə qəzadır deyir bunu şair
Bəzəndirir onu Seyyid Əzim Şirvani.

Vəli yanımda mənim yoxdur onca əhmiyəti
Dadandırıb özünə çünki çox müsəlmanı.

Bəlasını gözünün mən alım aman saqi
Gətir, gətir mənə tiryaki- "Yəzd", Kaşani

Alışdır od, maşanı ver, bizi elə hazır
Silib təmizlə, cırıq-cındır ilə hoqqanı.

Yapışdır ağzına hoqqanın üç qırıq tiryak
Odu yaxın tut üfür, qoyma çatlasın yanı.

Çəkim onu o qədər: ta ki çatlasın nəşəm
Qara bulud kimi tutsun dumanı dünyanı.

Yanımda söyləmə İran sözü kefim pozulur
Gətir fəqət mənə sən ixtira-İranı.

Dağıtma nəşəmi bu sözlər ilə əlhasil
Çağır hüzuruma naqqal Kabla Səlmanı

Tat Əhməd ilə gər olsam cahanda həmhoqqa
Dəxi salıb yada mən gülmərəm Nərimani
Solumda Cabbar ola gər sağımda "İsqandar"
Önümdə Məşdi Səfər saymaram bəyi xanı.

Xəyal etmə ki, yoxdur pulum, cibim boşdur
Yanında saxla girov bu papağı-toqqanı.

Bu gün varıq sabah Allah bilir nələr olacaq
Tutub ki qalmıyacağıq bu dari-dünyanı.

Tumançaq aləmi-islamı cümlə gəzmək olar
Mərənd, Xoy ilə Səlmas, Rəşt, Tehranı.
Qadın, çoluq-cocuq ac olsa çəkmərəm qəmini
Dilənçilik eləsin görmüşəm Xorasanı.

Fəqət kefim duru olsun, tamam nəşəm təxt
Dolandırar anası Xırdanı, Süleymanı.

Nə isə qüdrəti cuşə gələndə Allahın
Yaratmış olsa gərəkdir bütün müsürmanı.

Ki böylə qeyrətü namuskardır hamısı
Tutubla əldə həmi işrəti həm imanı
Həmi bu aləmi-hiçi, həmi də üqbanı

*Kefsiz*


PoTTEPЪ
Molla: Pərvərdigara, sən bu gimnazistlərə xeyli ömür əta elə.
ملا: پروردگارا، سن بو
گیمنازیستلره خیلی عمر عطا ایله.
اوجار استانسیاسنده مسجدده
Ucar stansiyasında məsciddə
Molla əmi, al bu bir manatı, bu gimnazistlərə dua elə.
ملا عمو، آل بو بیر مناتی، بو
گیمنازیستلره دعا ایله.
Camaat: oxqay, a gimnazistlər.
جماعت: اوخقای، آ گیمنازیستلر.




"Uxodite, papaxski tatar!"
"Уходите, папахские татары!"

## MƏHƏRRƏMLİKDƏKİ MƏSARİFİN QƏDƏRİ İRƏVANDA

***Nəqd pul Molla Qasıma***

Camein birinci şəbistanı 200 manat, ikinci 100 manat, üçüncü bir o qədər, dördüncü də ki habelə.

***Şəhər məscidində***

150 manat, Molla Hənifə, Mir Cəlilə də bir elə.

***Hacı Novruzəlibəy məscidində.***

Özünə bir o qədər, şagirdinə yarısıca, Molla Abbas Dərviş oğlu və Kökəmərli də hakəza.

***Dəmirbulax məscidində***

200 manat Hacı Cəfərə də yarısıca, Əbülqasim təkyəsində babət.

- Mollalara, seyidlərə, tələbələrə Allah bilsin...
- Fəqirlərə bircə qəpik də.
- Şəkərə, düyüyə, yağa, çaya, bala, una, şama, qaraya, cığ-cığaya, neftə, lüleyinə, kəfənə, tütünə, kömürə, stəkan-zirə, qəhvəyə, südə, musiqiyə, dəvəyə, vay dədəm vay, gözüm qaraldı. Mən buxqalter deyiləm ki, buna məhşər buxalteri gərək.
- İtən qaloşları, başmaqları bilmək istəyən qiyamət günü dəvələri saysın. Qaldı şairlər və növhəxanlar, bu da qalsın gələn məhərrəmə.

*Noxtasız.*

## BALACA FELYETON

### DÜBBƏ

*(Keçən nömrənin axırı)*

İranın bu dərəcədə abad olub tərəqqi etməyinə neçə səbəblər varsa birisi və bəlkə ən birincisi də bu dübbə məsələsidir. Və bu qədər ki, İranda xan var, vəzir var, əmir var, sahibi-mənsəb var çoxusu ya mütrüblükdən ya mütrüb babalığından ya dəlləklikdən və yainki dübbəçilikdən o məqama çatıblar. Bu qədər ki, dövlətdən cirəxor və müstəmrixor var, onların hər birisi ya şaha ya vəliəhdə bir mətəl deyiblər ya onları söyüblər ki, xoşlarına gəlibdir və yainki vəliəhd hüzuruna bir uşaq aparıblar ya da bir dəlxəklik ediblər ki, əllərinə ixtiyar tapşırılıb, ləqəb sahibi olublar.

Məsələn: Səidülməmalik ki, axırda ona Təbrizdə Əmir Həşəmət ləqəbi vermişdilər və Təbrizi bu axır vaxtlarda qan dəryasına döndərən o olubdur ki, beş-on rus saldatını öldürüb sonra özü qaçıb əlsiz ayaqsızları girə veribdir, əvvəl Qaradağdan gələndə vəliəhd hüzurunda dünbək çalan və qaraçı oynadan imiş. Müxtəsəri-kəlam, İranda hər vilayətdə ümurat bu qəbil əşxasın əlindədir. Və İranın dövlətini, pulunu bir bunlar yeyir, bir də ki seyid, molla, dərviş, cindar ki, nəsilbənəsil ocaq olub kəşfi-kəramət sahibidirlər. Belə ki, mərhum Müzəffərəddin şah nə vədə ki, gecə bir hövnalk və qatmaqarışıq bir yuxu gördü, sübh tezdən durub bir seyid və ya bir molla çağırıb ona bir kənd bağışlardı və bir balaca ürəyi darıxsaydı, bir mərsiyəxan gətirdib mərsiyə oxutdurub ona bir toqqa şal, yüz tümən ənam və bir də bir ləqəb verib eylərdi həcəmətüz-zakirin. Tehranda gəzməyə çıxanda qabaqca hökm elərdi ki, nə qədər küçələrdə dilənçi, yolçu, şikəst, fəqir, füqəra varsa hamısını təmizləsinlər ki, məbada şahın gözü sataşıb ürəyi bulana...

Bəhərhal mənim bunlarla işim yoxdur, söz sözü çəkib bura gətirdi. Mənim məqsudum ancaq dübbəni tövzih etməkdir. İştə keçək mətləbə:

Təbrizdə beş il sərasər ki, camaat adı məşrutə üstündə dava etdilər, əsil həqiqətə baxsaydı onlar məhz dübbəçilik idi. Məsələn: Dəvəçi məhəlləsi yağı olub əncüməni-islamiyyə tərtib verib, o biri məhəllələr ilə atışırdı. Birdən görürdün bir tərəfin səngərindən çağırırlar ki:

"Ay gədə hoy, atma, əl saxla çaşta çıxırıq". Bir az keçirdi o biri səngərdən səs gəlirdi ki, "Carkiş oğlu carkiş! Qoymasan ki, bir canasınar tiryak çəkək, araq içək?" Nəinki bir dava meydanı bəlkə məclisdə də, əncümədə də bu cür bir-birlərini biləyə sərimişdilər.

Məsələn: birisi durub bir nitq eləyəndə hər tərəfdən bəli, bəli, sədası asimana bülənd olurdu. Soruşanda da ki, ay hacı qəmiş niyə Məvaliddövlənin hər sözünə bəli, bəli deyirsən? Cavab verirdi ki: "Dinmə sərimişəm, qoy desin, desin yorulsun otursun yerində". Doğrudan da birisi ağzın açıb bir söz danışanda ki bir nəfər qapıdan girirmiş hamı birdən durub ayağa ya Allah, ya Allah, mərhəmətiniz artıq, iltifatınız ziyad deyirmişlər və bu müddətdə də o yazıq ayaqüstə qupquru quruyurmuş, istəyirmiş genə sözə başlasın əlahiddə bir adam gəlirmiş və genə bu qərar ilə ya Allah, ya Allah, mərhəmətiniz artıq, iltifatınız ziyad olurmuş. Bunların çoxu da nəinki ehtiram bəlkə o gələni şişirtmək və biləyə sərimək olurmuş.

İndi ki bunları bildin gəl, boylum mən sənə bir fənd öyrədim, həmişə yadında saxla yaxan qurtarsın. O da budur ki, zəmani ki, sən bir iranlı tapdın və başladın o iranlıya İrandakı faciələrdən nağıl etməyə və təəssüf etməyə, onda o iranlı başın aşağa əyə-əyə sənə bəli, bəli, bəli deyəcək, daha sən sərvəqt ol, bil ki, o səni səriyibdir. Yoxsa istər İran başabaş qırılsın, iranlının halına nə təfavüt elər? Onunku bəli, bəli deməkdir ki deyir. Əgər istəyirsən deyə ki, filan, filan olmuş! Genə deyəcək bəli, bəli... Bir də insan gərək hər işdən ötrü kefini pozmasın. Dünyanı həmişə arsızlıq ilə, qəflət ilə yeyiblər, yoxsa:

*"Rəftəni mirəvəd və*
*amədəni miyayəd*
*Şodəni mişəvəd qüssə*
*be ma mimanəd".*

Daduş! Genə Allah bərəkət versin dübbəyə...

***Cüvəllağıbəy***

## BAKIDAN

Möhtərəm "Molla Nəsrəddin" məcmuəsinin 47-ci nömrəsində "Dərdmənd" imzalı Bakının təziyəsinin birövnəq keçməyinin xüsusunda yazılan məqaləni oxuyub mütəhəyyir qaldım. Görünür ya məqalə sahibi Sabunçu və Balaxanını Bakıdan hesab eləmir və yainki cənab Dərdmənd dərdinin çoxluğundan Bakının ətrafından xəbəri yoxdur. Müxtəsər, müşarileyh cənablarından təvəqqə olunur ki, bundan sonra belə şeyləri yazanda həqiqətini bilib yazsın.

Bəndeyi-xuda! Məgər sənin bu il mədəndə olan əzadarlıqdan xəbərin yox imiş? Hansı ki, bu il ildəkindən rövnəqli və keçən ilki təkyələrdən əlavə neçə-neçə təkyələr təzədən iftitah olundu və bu manelər ilə bərabər genə bu təkyədən o təkyəyə şeypur, balaban çalıb zəncir vura-vura gedib təziyələri rövnəqləndirirdilər. Hələ aşura günü Bülbülədə neçə nəfər başyaranlardan şəhid olanları demirəm. Bari təala həzrətlərindən cəmi başyaranların ibadətinin qəbul olunmağını istirham edib və əncüməndə rövzəpəzlik ilən axundun təkfir çomağını ağlamaq xüsusunda danışanların kəlləsində kəskin eləməyini bazxast edib və cümlə baş yarıb şəhid olanlara da yaxşı, gözəl hurilər əta olunmağını istəyib xətmi-kəlam edirəm.

*Nəqarətülmülk*

## ƏDƏBİYYAT
## NƏNƏ VƏ QIZIN SUAL-CAVABI

Nənə - Qızım, qızım nər qızım,
Zülfü müənbər qızım.
Dur özünə etgilən
Zinətü zivər qızım.
Elçi gəlir indicə
Dur düz əməlli otur
Gəlcək otağa onlar
Ol dəm ayaqüstə dur
Qəlyana od qoygilən
Onlara qəlyan gətir.
Eyib tutar gözlə ha!
Kablayı Hacər qızım.
Qız - A nənəcik Zərnənə
Ey dürr gövhər nənə
Kim olacaqdır mənə
Söylə bari ər, nənə.
Nənə - Çox gözəl oğlandı o
Mən dediyim, ay bala.
Altmışatək var yaşı
Çox da qocalmıb hala
Saqqalı da ağdısa
Rəng yaxır saqqala
Sənəti eşşəkçilik
Kablayı Qənbər qızım.
Qız - Ay nənəcan qorxuram
Çox qocadır o kişi
Ordu batıb bir dənə
Ay nənə, yoxdur dişi.
Gündə bir arvad alar
Heyvərəlik hər işi
Lap büzüşüb üz-gözü
Bir qoca əntər, nənə.
Mən sevərəm ki mənə
Bircə cavan yar ola
Pərçümi birçək qoya
Qırmızıca nar ola
Beldə də piştov, qəmə
Şəstli sərdar ola.
Bir igit oğlan ola
Misli, Qəzənfər nənə.
Nənə - Sən hələ xamsan qızım
Çox da cavan, varı yox.
Yox yeməyə əppəyi
Ta olasan qarnı tox.
Qəhvədə oynar qumar
Ağlı puç, imanı yox
Keyflənibən hər gecə
Küçəni ölçər qızım.
Gər sözümü sən mənim
İndi qəbul etməsən
Doğma atan sevdiyi
Kablayıya getməsən
Razı olub bu işə
Vallahi tapdar səni
Qol qoyuban bitməsən
Qardaşın Əsgər, qızım.
Qız - Çara nədir ay nənə
Şapkalını istədim
Vermədiniz, getmədim
Siz ona kafir dediz
Hər kəsi sevdim genə
Niyyətimə yetmədim
İndi ki güc var ərim
Qoy ola Qənbər nənə.
Nənə - Bax barəkallah, qızım
Bax barəkallah, qızım.

*Gülgəz bacı.*

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## TİFLİSDƏ "ŞƏRQ" ADINDA
## TƏZƏ MÜSƏLMAN MƏTBƏƏSİ

Voronsov küçəsində Baranbəyov karvansarasının qarşısında Kustanovun mülkündə təzə açdığımız mətbəədə qəbul olunur hər cür çap işləri: kitab, paket, blank, sçet (hesabnamə), vizit kartaları, elannamələr, qəbz dəftərləri, kontor dəftərləri, toy dəvətnamələri və habelə qeyri sifarişlər. Mətbəəmizdə müsəlman, rus, firəng, gürcü, erməni hürufatı mövcuddur. Sifarişlər təmiz və gözəl surətdə çap olunub tezliklə sahiblərinə göndərilir. Qiymətlər nəhayət dərəcədə ucuzdur: min danə paket və min danə blank (böyük format poçt kağızı) gözəl surətdə çap olunmuş, yəni hər kəsin adı, familiyası, ticarətinin adı, adresi, tarix yeri həmin blankda və paketlərin üstündə çap olunmuş başa gəlir poçt xərcilə on bir manata və həmçinin qəbul edirik hər cür ştempellər. Xahiş edənlər aşağıda yazılan adresə müraciət etsinlər:

*Mətbəənin sahibləri:*
Ələkbər Məmmədov, İsmayıl Həsənzadə.

*Адресь:*
Тифлись, Воронцовская ул. типография
"Шяркь" Исмаиль Гасанзаде.



Aşqabad məscidində biçarə oğrular

Несчатные воры въ Асхабатской мечети

6 rəbiüləvvəl 1330 **Yeddinci il** 12 февраля 1912г.

# ملا نصر الدين

**№6 Qiymәti 12 qәpik.** **МОЛЛА НАСРЕДДИНЪ** **Цена 12 k. № 6**

*Müsəlman uşaqlarının gimnaziya təhsili:*



***Birinci klas*** ***İkinci klas*** ***Üçüncü klas***

***Dördüncü klas*** ***Beşinci klas, yəni "Erlıx" müalicəxanası***

Litoq. S.Bıxova.

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində:12 ay--altı manat.
6 ay...........................................3 manat yarım.
3 ay...........................................2 manat.
Kasıblara...................................12 ay--5 manat.
*6 ay..............................................3 manat.*
3 ay...........................................1manat 60 qəpik.
1 ay...........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay.........................................7 manat.
6 ay...........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə.........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*6 rəbiüləvvəl 1330* Hər həftə nəşr olunur *12 fevral 1912*

## ŞƏRAB

*Deyir kim ay dəli, canə verir ziyan şərab?*
*Edir gülüzlülərin rəngin ərğəvan şərab.*
*Xərab olur deyir, içdikcə qəlbi can şərab*
*O kim deyir bu sözü söyləyir yalan şərab*
*Olur kim içsə biri, bir piyalə qan şərab!*

*Onu müzürr bilən qanmır, anlamır, yanılır*
*Qazancı, ləzzəti insaf edilməyir danılır,*
*İçən məgər onu bihuş məst olub ayılır?*
*Bu nəşədir ki, onu bəxş edir rəvan şərab!*
*Xoşa ona ki içir ta olur piyan şərab!*

*Pis olsa idi onu sıxmaz idi insanlar*
*Yasaq edərdi hökumət, şahü sultanlar*
*İçərdimi onu gər olsa pis müsəlmanlar*
*Əfəndi, məşhədi, hacı, bəy ilə xan şərab*
*İçir bir onca kim hətta olur piyan şərab!*

*Əlin əsası, dizin taqəti, gözün nuri*
*Mizin yaraşığı, can qüvvəti, belin zuri*
*Açarı eşqin, atı ağlın, istəyin guri*
*Həyatın atəşidir tək bir istəkin şərab!*
*Xoşa ona ki içir ta olur piyan şərab!*

*İçib doyunca ki, keflənmədin nə ləzzəti var*
*Küpün dibində zibillənmədin nə ləzzəti var*
*Piyan soqaqları vellənmədin nə ləzzəti var*
*Yazıq ona ki, nədir bilməyir cahan şərab*
*İçərsə bircə içim pir, olur cavan şərab.*

*Odur ləzizi-müqəvva, o gunə bir nemət*
*Ki içsə yüksəlir başı ərşə hər millət*
*Səbəb budur irəli getməyə elə qeyrət!*
*İç ol qədər ki, elə kəsbi-nam şərab*
*İçir hər inteligent, arif, anlayan şərab.*

*Deyil bədəl hələ tiryak, çərəs, qəlyanə*
*Ki bəsləyir bədəni faidə verir canə*
*Dönür gəda içə gər bircə cürə aslanə*

*Edir də tülkünü bizzat arslan şərab*
*Bağışlayır belə pələnglərə lisan şərab*
*Ürəkdə bircə sözü saxlamaz nihan şərab*
*Yamanı yaxşı edir, yaxşını yaman şərab.*

*Kefsiz*

## ALLAH KƏRİMDİR

Elə bu söz həmişə mənim dilimdə əzbərdir... Ay baba! Bir para axmaqlar başlayıblar ki: "Ay İran belə oldu, osmanlı elə oldu, millət dala qaldı". Canım, bilmirəm niyə bunlar özlərini qurt qayırıb salıblar ortalığa? Bunlara bir deyən gərək ay səfehlər, müsəlmanların sahibi var, dinin köməyi var, İranın sahibi var, özü hifz eləyəcəkdir. And olsun dərviş çağalasının Dəyirmanlar küçəsində dediyi məzhəkələrinə onda gördün ki, bir göy atlı çıxdı tamam bu kafirləri qırım-qırım qırdı tökdü yerə. Sən nə xəyal eləyirsən, məgər biz sahibsizik? Kimin nə cürəti var bizlərə bir söz desin və bir də qardaşlarım, ümidinizi Allaha bağlayın, deyin Allah kərimdir...
Necə ki, şair deyir:

*Fikr etməyin ay şiələr, Allah kərimdir*
*Qəndabı içib yağlı plov padvala doldur*
*Qonşuların ac yatsalar Allah kərimdir*
*Başına qapaz salsa da yüz min kərə düşmən*
*Gər döysələr, öldürsələr Allah kərimdir*
*Dünyadə gərək mömin ola qüssədə daim*
*Sən qəm yemə zülm etsələr Allah kərimdir.*
*Allah kərimdir!*

*Dul toyuq*

## XƏBƏRLƏR

***İrəvan*** - gimnazistlər yumruq duelinə çıxmışdılar, birinin ağzı-gözü qanamışdı. Allah rast gətirmişdi ki, müsəlman idilər, yoxsa iş uzun çəkəcək imiş.

Şeyx Məhəmmədəli Vaiz pulu almadığına görə minbəri elə bərk silkələyir ki, az qalır Hacı Cəfər məscidi dağılsın.

***Səbzəvar*** - Buranın müqəddəs və möminləri gecə və gündüz elədikləri arzularına çatdılar, ehtimal var ki, gecələri bir təntənəli çırağan eləsinlər.

Yaşasın danosçubaşı Rəcəb!

## RƏVAYƏT

Bir gün mən Nəcəfdə oxuyurdum, aşura günü gördüm bir arvad gəldi başvuranların qanına barmağını batırıb yaladı. Mən dedim: arvad, nə qayırırsan? Arvad cavab vermədi. İki ildən sonra genə getdim ziyarətə, bir də gördüm daldan mənə bir ağac vurdular, dönüb baxdım gördüm ki, haman arvad deyir: "Bax, mən o qanı bu uşaxdan ötrü yeyirdim!". Gördüm qucağında bir dana uşaq var. İndi mən də bacılara xəbər verirəm ki, hər kəsin uşağı olmayır, mənə yazsın, aşura qanından bir qədər yığıb saxlamışam, göndərim.

*İmza: Məşədi Şeyx İbrahim Axund*

## OĞURLUQ

Əvvəla bunu bilməlisiniz ki, oğurluq və rəşadət ikisi də bir sözdür. Özgə yerlərdən xəbərim yoxdur. Ancaq bizim İrəvanda qayda belədir: uşaq ki üç yaşına yetişdi, anası başlar yavaş-yavaş oğluna rəşadət öyrətməyə. Gecələr kişi yatandan sonra xəlvətcə deyər ki: "Oğlum, get ağayın cibindən pul çıxart gətir mənə, hamama gedəndə sənə qaqa alacağam." Uşaq da yavaşca gedib dədəsinin cibini töküşdürər, pulları çıxardıb gətirər anasına. Ha... Ha bir üç dörd ildən sonra yavaş-yavaş qonşuların toyuq-cücəsini oğurlar, sonra başlar məhəllələrdə aftafa, lüləyin, filan oğurlamağa. Elə ki on səkkiz yaşına yetişdi: gedər dam dəlməyə, yol kəsməyə, onda olar rəşid! Daha heç kəsdən qorxmaz. Mən bu oğruluqların hamısını bilirdim, özüm də çox rəşidəm, ancaq bircə şey var ki, onu bilmirdim, onu da bu neçə günlərdə öyrəndim. Allah baisin atasına rəhmət eləsin. Mən at oğurluğu, eşşək oğurluğu, aftafa oğurluğu, pul, mal, toyuq, cücə əlqərəz, hamısını eləmişəm, bircə söz oğurluğunu bilmirdim, onu da bir ədibdən öyrəndim. Doğrudan bu elə mərdi-rind imiş ki, şeytanın da xəbəri olmayıb. Allah ona ömür versin ki, bundan sonra müsəlman qardaşlar bu rəşadətdən çox mənfəətbərdar olarlar.

*Yetim Cücə*

## ƏDƏBİYYAT

Usandım üstünə gülməkdən ey divanə millət dur!
Yoruldum məsxərə yazmaqdan ey divanə millət dur!

Yolunda getdi dinim, məzhəbim, ayin, imanım
Məqamım, abruyum, ehtiramım, izzətim, şanım.
Yanında kafir adlandım, həlal oldu sənə qanım
Səninçün qorxmaram ölməkdən ey divanə millət dur!
Usandım üstünə gülməkdən ey divanə millət dur!

Gəhi babi, gəhi mürtəd, gəhi kafir adlandım
Döyüldüm, şaşkalandım, güllələndim, bəlkə odlandım
Qığılcımlar kimi qopdum, ocaqlartək alovlandım
Yorul bircə mənə söyməkdən ey divanə millət dur!
Usandım üstünə gülməkdən ey divanə millət dur!

Sənin üstündə məndən oldu rəncidə Hacı Səfdər
Mənə bidin, laməzhəb dedilər mollalar yeksər
Nədir təqsirimiz çəkdik ki, bunca zəhmətü keyfər?
Qənim olsun sənə, vursun səni Allah, peyğəmbər!

Sənə molla çalır lay-lay yatırdır xabi-qəflətdə
Səni yar eyləyir hurilər ilə baği-cənnətdə
Fəqət dünyadakı huriləri kəndisi xəlvətdə
Çəkilmir bircə gün öpməkdən ey divanə millət dur!
Usandım üstünə gülməkdən ey divanə millət dur!

Ayıl! Bir bunca da yatmaq olurmu içməmişsən ki?
Verib dünyanı düşmənlər əlinə keçməmişsən ki?
Yaman da, yaxşı da birdir yanında, seçməmişsən ki?
Utanma abru tökməkdən ey divanə millət dur!
Usandım üstünə gülməkdən ey divanə millət dur!

Səni təxrib edir hakimnümalər hər zaman, hər il
Dedim pisdir sənə cəhl, anlamırsan anlama, sən bil
Üzünə özgələr bir gündə min dəfə tüpürsün sil
Kədərlənmə tüpürcüklərdən ey divanə millət dur!
Usandım üstünə gülməkdən ey biçarə millət dur!

***Kefsiz***



Nəsihət: Ay balam, sənin rəhmətlik atanı mən tanırdım, allahü əkbər deyilən kimi məsciddə hazır olardı, bəs sən niyə bu günə qaldın?..



*Deyirlər, imam yolunda bir qəpik verənə əvəzində birə min yetişəcək. Bu hesaba görə gərək indi mən milyon sahibi olaydım.*




*Bu zəhərmar ortalığa gəlməyincə adamın iştahı da gəlmir.*

## XEYİR İŞ

A kişi, Allah yetirəndə hər yerdən yetirir. Bakılılar doğrudan çox xoşbəxt adamdılar. Baxırsan, pul bunlarda, kef bunlarda, tərəqqi bunlarda. Xülasə, hər nə ağlına gəlsə bunlarda var. O gün Nikolayevski küçə ilə gedirdim, gördüm ki, "Hacı Hacağa " karvansarasının qabağında bir çox adam yığışıb. Dedim yəqin özgə vilayət hacılarından təşrif gətiriblər. Bakılılar da yığışıb öz hacılarından əhval soruşurlar. Bir az irəli yeriyib gördüm ki, xeyr, hacı-zad yoxdur. Karvansaranın qapısında bir dəstə urus qızları durub semiçka çırtdıyırlar. Ətrafdan da bakılılar həlqə vurub bunlara tamaşa eliyirlər. Bir az da yaxınlaşıb orda danışılan söhbətlərə qulaq asdım. Gördüm bakılının biri o birinə deyir ki: "Adə, Qasıməli, o divara dayanan matişkəni görürsən, min qat sən saxladığından yaxşıdır. Bir kafirin gözlərinə bax!.."

Xülasə, nə başağrısı, orda duranlardan hər birisi yoldaşına bu söhbətlərdən eləyirdi.

Axırda məlum oldu ki, o qızlar Rusiyada aclıqdan ölən qızlardandır ki, Lyazonov Rusiyadan gətirtdirib balıq promıslasına işlətmək üçün apartdırır. Bakılılar da yığışıb onlardan bəyəndiklərini aparıb evindən kənar bir otaq tutub saxlayacaqdır. Səhər qazanıb axşam aparıb onunla yeyəcəkdir (ev uşağı da cəhənnəmə, özləri nə tapsalar onu yesinlər).

Müxtəsər, bir neçə günün içində orda olan urus qızlarından nə qədər gözəl var idisə hamısını bakılılar öz aralarında pay-püşk eləyib qurtardılar.

Qərəz, Allah yetirəndə hər yerdən adama yetirir. Allah Lyazonova da uzun ömür verib "qürsi-Xəlil" qismət eləsin.

*Təzə dəmdəki*

## BALACA FELYETON

### MARALLARIM

*Ey dad Şümr əllindən,*
*fəryad Şümr əlindən*
*Köpək götürdü qaçdı,*
*bir cad Şümr əlindən*

Məhərrəm ayının iyirmisi ya iyirmi beşi idi, - Xəyalımdan çıxıb, oxuyanların da əhvalına təfavüt eləməz, - nahardan sonra çıxıb küçələrdə özümü yelə verirdim. Mərizxananın yanından ötəndə gördüm oradan bir şəxs çıxdı tanış adama oxşayan, amma üzü sarıqlı, qoltuğunda iki ağac qarğa kimi hoppana-hoppana mənə tərəf gəlir. Yaxınlaşan Ağayi-Fizuləlzakirini tanıdım ki, mənimlə qabaqdan aşna idi və neçə dəfə səyahətdə bizim üçün öz segahları ilə, şurları ilə, ələlxüsus bayatı-qacar ilə ləzzəti-ruhani veribdir.

- Ağa, azar olmasın, bu nə kökdü düşübsən?

Cavab verib dedi: Ayaqüstə dura bilmirəm, keyfiyyətim uzundur, məni mənzilinə apar, orada söhbət edərik.

Ağanı faytona mindirib gətirdim evə, dedim samavar qoysunlar, özümüz keçdik otağa. Ağa buyurdu ki, samavar yaxşı şeydi, ürəyim də artıq çay istəyir, amma əgər mümkün olsa bir az ayrı boğaz isladan versən bəd olmaz. Ərz etdim ki, bitədarükəm, inşallah gələn dəfə düzələr. Ağa bir papiros çıxardıb yandırıb, yanıqlı iki qüllab vurandan sonra bir ahi-sərd çəkib dedi: "Evim yıxıldı, bu il mədaxildən düşdüm, yaxşı qazanc eləyəcəkdim. Allah vermədi, nə etmək yəqin məsləhət belə imiş".

Dedim: bunlar hamısı ötüşər, insana cansağlığı lazımdır, yaxın əyləş söhbətini başla.

Ağa özünü yaxına verib bir öskürdü, sonra başladı hekayəti:

"Ərz eyləyim sizin qulluqi-şərifinizə bu il bizim Ərdəbildə şuluq olmağına görə vaxtında özümü buraya yetirə bilmədim. Özünüz bilirsiniz ki, bəndə həmişə məhərrəm ayına bir ay qalmış gələrəm Qafqaziya məmləkətinə, vaxtında oxumalı məscidlərimi müəyyən edərəm, ona görə də Allah mömin qardaşlara bərəkət versin, ildə beş-on şahı qulbeçələrinə çörək pulu apararam. Bu il məhərrəm ayına ancaq on gün qalmış varid oldum Badkubəyə.

Təkyələri bir-bir gəzdim, hər yerdə gördüm mərsiyəxan tutulub, getdim Gəncəyə olmadı, istədim İrəvan, Naxçıvan tərəfə gedim. Məsləhət görmədilər, dedilər: molla Mahmud Çakər ilə Şahtaxtlı oğlu o qədər vurarlar ki, bir belə də şişərsən. Çox fikir edəndən sonra, dedim: genə Dəccalabad yaxşıdır. Oranın əhli də möminündür və mərsiyəxanlara da ehtiram edirlər.

Doğrudur gəldim çıxdım Dəccalabada, məscidlərə getdim mərsiyəxan hazır, təkyələrə getdim həmçinin. Axtarıb bizim Molla Nəbiqulunu tapdım ki, Dəccalabadda çoxdan müqimdir, Ərdəbildə övrətilə dalaşıb dörd uşağı ilə qoyub gəlib Dəccalabadda iki övrət alıb. Biri iranlı, biri haman yerli. Yaxşı oğlandır, Allah öz pənahında saxlasın. Dəccalabadda əmələyi-mövtadan hesab olunur. Çox danışıqdan sonra Nəbiqulu məsləhət gördü ki, onunla birləşib Dəccalabadın meydanında şəbeh çıxardaq. Çox fikir etdim gördüm bu da bəd deyil, on üç gün şəbeh çıxartsaq azından altı-yeddi yüz manat ələ gətirmək olar. Mən də razı oldum. Molla Nəbiqulu məktəb uşaqlarından bir dəstə düzəltdi başladıq şəbehi: "Vəfati-Səkinə", "Tiflani-Müslim", "Ricəti-üsəra" və sayir müsibətlərdən gətirirdik. Yığılan cəmiyyəti görsəydiniz təəccüb edərdiniz. Pul göydən yağış kimi yağırdı. Bu minval ilə məhərrəmin doqquzunu başa verdik. Onuncu günü şəbehi şəhərin ətrafında bir böyük kəndin yaxınlığında çıxartmağa bina qoyduq ki, kənd əhalisi də feyziyab olsun. O qədər adam cəm olmuşdu ki, iynə ataydın yerə düşməz idi. Molla Nəbiquluya dedim ki, bu dəfə sən "Cəbrail" şəbehi olacaqsan.

*(Axırı var)*

***Ceyranəli***

## NƏZM

*Mən ki müsəlmanların irşadiyəm*
*Mollasıyam, şeyxiyəm, ustadiyəm*
*Qansoranı, zaliyi-cəlladiyəm*
*Nayib-imaməm bulara hadiyəm.*
*Səsləyərəm, eyləyərəm həmhəmə*
*Bunları yeksər yığaram dövrəmə.*
*Ağladaram cümlə qəzetxanları*
*Bağladaram cümlə dəbistanları*
*Susdurarm firqeyi-ürfanları*
*Qandıraram cümlə müsəlmanları*
*Elm gərəkməz kişilər, adəmə*
*Cahil olun siz, babalız zəmməmə.*
*Bizlərə məktəb nə gərəkdir, kişi!*
*Elm, hünər cümləsi kafər işi*
*Lapca çönübdü fələyin gərdişi*
*Məsxərəlikdir buların hər işi*
*Böylə iş olmaz oxusun müslimə*
*Tapşıraram görsəm əgər hər kimə.*
*Nəyimizə lazım bizim elm, ədəb*
*Ömrümüzü puç eləyək ruzü şəb*
*Siğə gərək bizlərə zövqi-tərəb*
*Ta ki dola ciblərimiz bisəbəb.*
*Olmasa bunlar bataram mən qəmə*
*Zəf gələr peysərimə, dünbəmə.*
*Şükürlər olsun hələ vardı mürid*
*Şükr olur köhnə mətaım xərid.*
*Vardı dalımda hələ yüz min yezid.*
*Noxta besər çoxlu cavani-rəşid.*
*Dildə söyüş, beldə də pişto, qəmə*
*Cümlə tikiblər gözünü hökmümə.*
*Hansı qazet mollaya dair yaza,*
*Yumbalanıb düz yolu birdən aza*
*Tutdu yəqinən oları bir qəza*
*Nərə vurub baqqala həm bəzzaza.*
*Mən bağırıb bildirərəm aləmə*
*Kafir olubdur bu qəzetçi həmə*
*Qoyduraram cümləyə qol ərzəmə*
*Göndərərəm düz Nəcəfə xəlfəmə*
*Orda baxa işlərə ta məhkəmə*
*Söyləyələr cümləsi kafər həmə*
*Kafər, həmə kafər, həmə.*

***Naxırçı***

## HİND ARXINDAN

Keçən gecə bir nəfər mötəbər bəylərdən bizdə söhbət etdiyi əsnada bəylərin birisi bir balaca dua çıxartdı. Bu duanı müşarileyhə verən Molla Hüseynquludur. Duada yazılıb: "Yetmiş dəfə sübhanallah, on dəfə əstəğfürullah, on iki dəfə sübhanallah, üç dəfə əstəğfürullah". Söhbət qurtarandan sonra belə məlum oldu ki, haman molla Hüseynqulu o duanı verib haman şəxsə və deyib ki, neçə gün oxuyandan sonra xudavəndi-aləm haman şəxsə bir gözəl oğlan kəramət eləyəcək. İndi hər kəsə oğlan lazım olsa, cənab molla Hüseynquluya müraciət eləsin. Həqqi-zəhmətə ancaq bir top tənzif, əmmamədən ötrü kifayət edər. Duanı lazımdır ki, axşam oxumaq.

*İmza: Kalbalayı*

## POÇTA QUTUSU

Vladiqafqazda Qulam Kazımzadəyə: mən elə qanıram ki, biz də sizdənik, siz də bizdənsiniz, təfavüt burasındadır ki, bir-birimizin dilini qanmırıq.

*Müdir və baş muhərrir: Cəlil Məmmədquluzadə*



## İDARƏDƏN ELAN

Möhtərəm müştərilərimizə məlum edirik ki, məcmuələri çatmayanda tezliklə idarəmizə xəbər versinlər və abunələrin nömrəsini də yazsınlar və keçən ildən hər kəsə məcmuə borcumuz qalırsa, onu da yazsınlar.




Gəncədə aftamabil

17 rəbiül 1330 | *Yeddinci il* | 23 февраля 1912 г

# ملا نصر الدين

№7 Qiymәti 12 qәpik.

# МОЛЛА НАСРЕДИНЪ

Цена 12 k. № 7




Litoq. S.Bıxova.

*Balabanın səsi heyvanı ürküdüb*

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində:12 ay--altı manat.
6 ay.....................................3 manat yarım.
3 ay.....................................2 manat.
Kasıblara.................................12 ay--5 manat.
*6 ay.....................................3 manat.*
3 ay.....................................1manat 60 qəpik.
1 ay.....................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay.....................................7 manat.
6 ay.....................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə.......................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*17 rəbiüləvvəl 1330* *Hər həftə nəşr olunur* *23 fevral 1912*

## MÜSƏLMANÇILIQ

Hər kəs Tiflisdədir və hər kəs ki, axır vaxtlarda müsəlman və rus qəzetlərini oxuyur - o bilir ki, Tiflisdə müsəlman məhəlləsində müsəlman camaatından ötrü bir teatro qayrılır və bu binanı qoyan və əmələ gətirən Yusifbəy Tahirovdur.

Bu xüsusda Tahirov cənablarının tərifini qəzetlərdə hamı gərək oxumuş ola: mən də oxumuşam və bir dəfə də yox, beş dəfə, on dəfə, nə bilim hər gün yerindən durursan və qəzeti əlinə alıb görürsən ki, yazılıb teatr belə oldu, Yusifbəy Tahirov elə oldu.

Yusifbəyin tərifini qəzetlərdə yazan onun qulluqçuları və yoldaşlarıdır. Qəzeti oxuyanların çoxu yad ruslar, gürcülər və yad erməni, müsəlmanlardır. Onlara təfavüt eləməz ki, Yusifbəy kimdir? Onlar oxuyub "Afərin belə şəxsə" deyib keçirlər. Amma mən yazıqdan heç kəsin xəbəri yoxdur. Heç bilən yoxdur ki, mən nə çəkirəm, heç mənim dərdimdən xəbərdar olan yoxdur.

Sözün əsli budur ki Yusifbəy Tahirov naxçıvanlıdır. Mən də naxçıvanlıyam. Mən görürəm ki, Tiflisdə təzə camaat teatrı onun adına bağladı və insafən görürəm ki, məhz Yusifbəyin səy və hümməti ilə bu teatro əmələ gəldi. Amma söz burasındadır ki, mən də naxçıvanlıyam və qeyrətimə sığışdıra bilmirəm ki, mən dura-dura və mən olan yerdə məndən savayı bir özgə adam gəlib burada bir ad çıxartsın, gəlib Tiflisdə şöhrət qazansın.

Sözün doğrusu, bu dərd məni öldürür. Əvvəla budur ki, biz naxçıvanlıyıq, Naxçıvanda belə qayda çoxdan qoyulub ki, bir tacirin şöhrətinin dərdi qeyri bir taciri qoymaz yuxu yuxulasın. Bir bəyin dövlət və izzətinə qeyri bir xan həsəd aparar. Hətta iki axund ad və şöhrət üstə həmişə bir-birilə müddəi olarlar.

Mən Yusifbəy Tahirovun şöhrətini sığışdıra bilmirəm. Çünki, əvvəla, mən naxçıvanlıyam, o da naxçıvanlıdır. Və saniyən burada bir az müsəlmançılıq da var. Bir müsəlman qardaşın şan və şöhrəti qeyri müsəlman qardaşa heç vaxt xoş gələ bilməz.

Odur ki, danosbazlıq və şeytançılıq vıstavkalarında qızıl medal alan əvvəl müsəlman qardaşlar olur.

Xülasə, doğrudan doğrusu, bu Yusifbəy Tahirov həmşəhrimin şöhrəti məni öldürdü. Axır pəs nə edim. Çox fikirdən sonra dedim genə vallah şeytançılıq, genə xəbərçilik, genə qoy barı Tahirovu avam içində töhmətləndirim, bəlkə bir tövr xarab olub qoyub gedə işinə.

Aha tapmışam.

Cəmi uzunsaqqal, uzun əba, uzun papaq, uzun çuxa yox və uzun ətək mömin və dindar abırlı və ismətli müsəlman qardaşlardan təvəqqə edirəm ki, bu kağızı oxuyan kimi gedib təzə teatrın akuşkalarının qabağında qayrılan lojalara tamaşa eləsinlər və orada işləyən qulluqçulardan soruşsunlar ki, o lojalar kimlərdən ötrüdür. Mən soruşdum, mənə belə cavab verdilər ki, "burada qabaqdan pərdə kimi bir şey asacayıq ki, bu lojalarda hərdənbir müsəlman xanımları əyləşsinlər".

Di get, dəxi sözün nədir, bu da sənə teatr. Bəli, müsəlman xanımları əyləşsinlər. Çox əcəb, qoy əyləşsinlər, dəxi sən küçədə Yusif bəy ilə məni bir yerdə görəndə, nə səbəbə əvvəl ona baş əyirsən, sonra da mənə baş əyirsən. Mən ki övrət mövrət sözü danışmıram. Keçənlərdə də həyə danışmışam, qələtdi tutmuşam, bir səhvdi eləmişəm. O vədə uşaq idim, elə bilirdim ki, yazıçı odur ki, hər sözü aşikar danışsın. Sonra axırda Bakı qəzetçilərindən təcrübə ələ gətirdim. Axırda bildim ki, müsəlman yazıçısı avama xoş gələn sözü yazmasa, işi keçməz.

Mətləbdən uzaq düşməyək: teatra sözüm yox, amma hər kəs müsəlman övrətinin teatra gəlməyinə razı olsa, yəqin ki, müsəlmançılığa xəyanət etmiş kimidir. O səbəbə ki, hələ dünyada teatr yaranandan indiyə kimi heç ittifaq düşməyib ki, teatra gedən müsəlman övrətinin üzünü naqafil bir yad kişi görməmiş olsun.

Budurmu müsəlmançılıq? Budurmu millətpərəstlik? Sən həyə millətin halına yanırsan, ona teatr qayırırsan - bu bir özgə iş, hərçənd bu barədə kitablarda bir cəzayi-xeyir ya bir savab yazılmayıb. Çünki teatrbazlıq genə hər necə olmuş olsa, şeytan işi qəbiləsindəndir. Qərəz, nə eləyirsən elə, amma dəxi övrət ilə nə işin var?

Xülasə, bir tərəfdən naxçıvanlılıq, bir tərəfdən müsəlmançılıq. Onunçun bu sözləri yazdım, amma məni dindirmə, ürəyim sıxılır!

*Molla Nəsrəddin*

## ƏDƏBİYYAT

*Vaizəm çün gedirəm mən səfərə*
*Hər avamın gözünə sürmə çəkəm*
*Söyləyibdir qlava bir nəfərə*
*Ki gedəm toxmi-əvamiyyət əkəm.*

*Get gözüm, baltanı da dibdən vur*
*Ağzına hər nə gələ söyləginən*
*Orada hiylə ilə damını qur*
*Gündə bir evdə fisincan yegilən.*

*Başım üstə gedərəm ol yerə mən*
*Orda bir əhli-maarif yoxdur*
*Talibəm yağa, bala, pəndirə mən*
*Bir də ki xərci-məsarif yoxdur.*

*Beşcə gün vəz eləsəm ordaca mən*
*Şəkk yox yuz, iki yüz pul alaram*
*Tək vücudəm bilirəm dəhrdə mən*
*Çünki arifləri işdən salaram.*

*Sözümün cümləsi tartan-partan*
*Bu iş ilə hamını ram edirəm*
*Paltarım ağdı üzümtək qardan*
*Sürət ilə hamı kəndə gedirəm.*

*İki yüz pul, iki yüz toxmi-toyuq*
*Dörd quzu, bir dana da kəbki-fərə*
*Cib dolu, şad hamı corma-colux,*
*İki pud xeyli gözəl yaxşı kərə.*

*Füqərə qanını sorram zəlitək*
*Oturub evdə Popov çay içərəm*
*Neçə evlər yıxaram Məmdəlitək*
*Nə günah etsə də düşmən keçərəm.*

*İmza: Təzə şair*

## ELAN

*Ucuz qumarxana*

Bununla ümumə elan edirəm ki, 1912-ci ildə yanvar ayının birinci günündə Ağdaşda açdığım qumarxanada hər cürə oyun oynamaq mümkündür. Bu qayda üzrə:

Əvvələn hər bank dürüst olanda mənə yetişəcək manata bir abbası yerpulu. Saniyən alacağam, manata iki şahı kağız pulu.

Salisən alacağam, hər bangdən on şahı dəstxoş.

Oynamağa xahişi olanlar bir kərə qumarxanamızı ziyarət etsələr məmnun qalacaqlarına əminəm. Yemək-içmək də mümkündür.

Müştəriləri məmnun etmək üçün lakeylik vəzifəsini də məəlməmnuniyyət özüm edirəm.

*Ağdaş milli qumarxanasının sahibi bəy Şaqqıldaqski*

## BAKI MÜXBİRİMİZDƏN TELEFON İLƏ

Bakı şəhər dumasının müsəlman qlasnıları dumada öz əvəzlərinə danışmaqdan ötrü yazıb xarici məmləkətlərdən adamlar istəyiblər. Bu günlərdə həmin adamların vürudu gözlənir.

Keçən gün müsəlman teatrına tamaşaçı müsəlman qardaşlar o qədər gəlmişdilər ki, 5 məclisli "Revizor" oyunu saat on birdə qurtardığından, tamaşaçılar əl çalıb artistlərdən axırıncı pərdəni bir də təkrar eləməyi tələb elədilər. Polisə mane oldu.

Müsəlman məhəlləsinin suflyorunun dünən səsi tutulduğundan artistlər həyəcana düşüblər. Belə danışırlar ki, bu günlərdə suflyoru həkimlərin məsləhətinə görə müalicə üçün Tiflisə aparacaqlar.

Müsəlman artistləri özləri üçün Fransadan yazıb istədikləri "rol əzbərlədən maşına"nı dünən poçtdan təhvil aldılar.

Axşamlar pasaj qabağında ayaqüstə dayanıb gəlib-gedən əcnəbi xanımlarına tamaşa edən müsəlman qardaşların ayaqlarının ağrımağını qrado cənabları nəzərə alıb bu biçarələrin hərəsini bir həftə "arestni domda" oturdub yorğunluğunu çıxartmaq əmrini vermişdir.

Şəhərin müsəlman hissəsində yağışlı günlərdə küçələrdən keçmək üçün şəhər duması 12 palçıq lodkası zakaz vermişdir. Lodkalardan hazır olanları dünəndən işə düşmüşlər.

Suraxanılı bir nəfər Kərbəlayi Seyfulla adlı kişi öz kiseyi-xəsisanəsindən Suraxanı məktəbində oxuyan uşaqlara papaqdan tutmuş ayaqqabıya kimi almaq üçün pul ehsan etmişdir. Gələn il şkola üçün bir dəst imarət saldırmaq xəyalı da vardır.

*Kəndlərdə and içənlər: Qurana and olsun ki, bu torpaq Qafar bəyindir (Присяга на межевания).*



*Şəhərdə and içənlər: Qurana and içirəm ki, şəhər işlərinə ixlas ilə xidmət edəm və dost tanımıyam (çünki heç dost tanımamışam).*



*Присяга Бакин. Гласныхъ*

Bakı qazisi Cürci Zeydanin "Kərbəla yanğısı" adlı kitabını türk dilinə tərcümə elədiyinə görə qazi həzrətlərinin tərcüməsi Cürci Zeydanın artıq xoşuna gəldiyindən mütərcim əfəndiyə həmin kitabın üstünə yazılmaqdan ötrü təzə bir ləqəb əta buyurubdur. Bu ləqəb hələ gizlin tutulur.

Neçə ay bundan irəli Bakı yaxınlığında olan Əmir Hacıyan kəndində üsuli-cədid üzrə davam edən məktəb qapanmışdır. Cümə axşamı kənd əhlindən birisi həman məktəbdə öz-özünə şam yandığını görər, camaata xəbər verdikdə kənd əhli yığışıb məktəbi pir qərar verdilər. Ətrafdan ziyarətə gələnlərin həddi-hesabı yoxdur.

*Təzə dəmdəməki*

## İBRƏT

*Cənab Molla Nəsrəddin əmiyə!*

Əvvəla ərzi-səlam və saniyən mala yəni kəlamdan sonra məlumunuz ola ki, mən cənabınızı tanıram (necə ki mollalar sizi tanıyırlar). Amma olsun ki, siz məni tanımırsınız. Ona görə lazım oldu ki, əhvala şərh verəm: cənab Molla əmi! Mən özüm zatınız təki başında əmmamə, çiynində əba, əlində əsa, saqqalında həna olan deyiləm və heç kəsə də rişxənd eləmənəm. Ancaq bu qədər var ki, həmişə məscidlərə gedərəm, vaiz və mərsiyəxanlara qulaq asaram. Məscid dedim yadıma bir zad düşdü. Qoy həzrətinizə ərz və nəql eləyim görək nə buyurarsınız. Belə ki: daim adətim üzrə bir gün genə Şah Abbas məscidinə getmişdim gördüm məscid lap doludur. Bu əsnada cənabınız təki bir molla ərşi-minbərə üruc elədilər. Moizənin müqəddiməsində qəsaiddən bir neçə əbyati şur şəhnaz üstə oxudular. O cümlədən bir də "Əli darəm çe qəm darəm" var idi. Bundan sonra başladı huri qılmandan, bəhri-ümmandan və yerin altında olan müsəlmanların şən və şövkətindən, elm və mərifətindən, izzü nemətindən danışıb dəm vurmağa. Bu arada bir laməzhəb dəhri:

*Başında var uzun saçı,*
*Saqqalı görməyib qaçı*
*Qılçasında şalvarı var*
*Ayağında sapoqu var.*

Ayağa durub dedi: "Ey rahnümayi-millət! Nə danışırsan? İslam hara, sən deyən zadlar hara. Budur Türkiyə məclisi-məbusanından başlamış dərbədər, Türküstan beçəvər, İran viraniyi-sərbəsər..."

Bunu eşidən kimi bir can verən adamın başı üçtə Əzrail duran təki fazili-şəhir seyhə çəkib buyurdular: "İran sahibi-xod darəd". Mən bu sözü başa düşə bilməyib həmişə fikir elərdim ki, bu nə deyən sözdür, amma indi yeri gəldi, deyəsən lap başa düşmüşəm, mətləbi anlamışam, kişi deyən düz imiş. Yəni cənab rahzənin minbərə üruci – sərkar Yefremxanın İranzəmində xürucu. Molla əmi, hər bir zada xudahafiz!

*Heyrani*

## BALACA FELYETON

### MARALLARIM

*(Keçən nömrənin axırı)*

Bir uca palıd ağacının baş budağına bir yeşiyi kəndir ilə möhkəm bağlayıb Molla Nəbiqulunu əyləşdirdim yeşiyin içində və tapşırdım ki, imam şəbehini şəhadətə yetirəndə ağacın başından "qütlül-Hüseyn" deyib qışqırsın. Özüm də bir sarı qoyun dərisindən tikilmiş kürkü tərs üzünə geyib şir şəbehi olub, damın içində gizlənmişəm ki, imamı şəhadətə yetirəndən sonra gəlim meydana. Şəbeh başlandı. Əgər desəm ki, qiyamət bərpa olmuş idi inanmayın. Nəinki camaat, yerlər, göylər, ağaclar hamısı deyə bilərəm səs-səsə verib nəvayə gəlmişdilər. Damın içindən baxıram, gözlərimdən yaş sel kimi axır. Şüheda şəbehi birbəbir gəlib şəhid oldular. Axır növbət yetişdi İmam Hüseyn şəbehinə. Bu şəbeh əlində qılınc meydana girəndə camaata bir vəlvələ düşdü ki, dil nəql etməkdən acizdir. İmam şəbehi şəhadətə yetəndə mən qulağımı verdim Molla Nəbiquluya tərəf, dedim indi qütlühüseyn səsi oradan gələndə camaatın yarısı bihuş olub özündən gedəcək. Bir də eşitdim bir zad top tək partladı. Camaat qarışdı bir-birinə, qorxub damdan başımı bir az çölə çıxartdım ki, görüm nə əhvalatdır. Gördüm yeşiyin ipi qırılıb Molla Nəbiqulu yeşik ilə ağacdan uçub düşdülər Qasim otağının üstünə. Otaq əzilib, Molla Nəbiqulu vay öldüm deyib zarıyır. Camaat Molla Nəbiqulunu götürüb bir evə apardılar. Bir də gördüm bir ağsaqqal kişi qışqırır: "Atana lənət ay imamın təziyəsinə şuluqluq salan". Camaat sakit oldu, hər kəs çəkildi öz yerinə. Növbət mənə yetişdi ki, damdan çıxıb dörd əl-ayağımın üstündə meydana gəlim, dam ilə də camaatın arası bir əlli qədəm olar. Damdan əynimdə tərs kürk heyvan sifətində çıxan, kəndin bir sürü iti tökülüb üstümə, başladılar məni dartışdırmağa. Mən nə qədər qışqırdım gördüm camaat eşitmir. Axır bir neçə adam görüb əli ağaclı gəlib bir tövr məni itlərin əlindən aldılar və haray gəlincə itlər məni bu gördüyün halətə saldılar. O vaxtdan mərizxanada yatıram. Aldığım pulların çoxusu xərc olub, Allah bilir nə vədə sağalacam.

Ağa sözünü qurtardı. Qulaq asıb dedim: türk məsələsidir deyərlər: "Dost yolunda covğun olar, qar olar". Nə eybi var, imam yoludur, imam özü fəryadına yetər. Ağa, Allaha pənah, - deyib başladı çay içməyi.

Təziyə aylarıdır, bu günlərdə minbərlərdə mərsiyə oxuyandan sonra bir fatihəxanlıq da edirlər. Mən də istəyirəm ağayi-Fizulul-zakirinin müsibətindən sonra bir fatihəxanlıq edib öz şairliyimi də göstərim. Qulaq verin:

*Bər Yezidi-pəlidü bədbünyad*
*Rişi-sərxan şəhri-Əsgərabad*
*Şeyxiyani-şərir həm şəyyad*
*Eyləyən siğə gündə bir arvad*
*Astarabadda gəzən cəllad*
*Quba şəhrində çox yava bir zad*
*Rövzəxanan mayəhayi-fəsad*
*Mürşid onlara Şümr, İbn Ziyad*
*Bir də dərbəndli xanəsi bərbad*
*Hərdəm səd hezar...*
*hər çe badabad*
*Amin deyən dillər lal olmasın.*

*Ceyranəli*

## DƏLİLƏR

*Sağ tərəf xan, bəy, seyid, cəlladi-cəhan*
*Acı Tırtır, Məşədi Qırqır, kablayı Zaman*
*Sol tərəf gürgi-sitəm, gav, xər, noxta, palan*
*Hər tərəf sail, həmmal, noxudçu, pinəçi*
*Başyaran, atbəzəyən, eh-eh edən həm sinəçi*
*Yeri var söyləyələr bizlərə dünya dəlisi*
*Biri məscid, biri minbər, biri pivə dəlisi.*

*Mirzə Qoşunəli*

## MƏŞHƏDDƏ HACILARIN MƏŞĞULİYYƏTİ

Hacı Əhməd - Hacı ağa salam əleyküm!

Hacı Məmməd - Əleyküssəlam.

Ə - Hacı ağa haradan belə?

M - Məşdi Məmiş gildən, rövzədən gəlirəm.

Ə - Bəs indi hara gedirsən?

M - Kəblə Səfərqulunun on gün rövzəsi var: qürubə iki saat qalmış, vaxt keçir, istəyirəm özümü mərsiyəxana çatdırım.

Ə - Dünən sübh harada idin?

M - Motal Hacı Nəsirgildə, rövzədə.

Ə - Günorta nə iş görürdün?

M - Hacı Nuru rövzə oxutdurur və plov da verir, ora mövud idim. Bir də bu məhərrəm və səfər ayları hamı dost-aşnaların evlərində rövzə oxunur, adam bilmir hara və hansının evinə getsin. Getməsən də inciyərlər və sonra mənim rövzəmə gəlməzlər. Xub, cənab ağa, sən niyə belə tələsirsən? Bu qarda, palçıqda hara şütüyürsən?

Ə - Axı mənim təqlidim ağayi-Xorasaniyə idi. Çünki indi mərhum olub, Ağayi-Təftəzənini ələm bilib ona təqlid etmişəm. Ona cəhət hər gün axşama üç saat qalmış gedib cənab Axund şeyx "Hümməmküməçi"nin payi-minbərində qüruba kimi Ağayi-Təftəzaninin risaləsini öyrənirik. Hacı ağa, sənin canın üçün beş gündür bu məsələnin üstündə aciz qalmışıq, qana bilmirik: "Abi-cari, abi-kür, abi-qəliz, dər təthir hər se ta yek hökm darənd, yainki abi-baran həm hökmi-əlahiddə darəd və abi ki əz qırna miyayəd çe hökm darəd?"

M - Hooooo!... Bu məsələ çox böyük və işkallı olmağa görə həlli vacibdir. Ancaq qırna, çünki kafir ixtiraıdır, onun suyu hər halda nəcisdir, mənim ki ağlım belə kəsir.

Ə - Təzə xəbər nə eşidibsən? Rusların Xorasana gəlməkdə xəyalları nədir?

M - Vallah, deyirlər bir polkdu ya molkdu təzədən gəldi. Dörd-beş dənə də qəlyan topu (mitralyoz) gətirdilər. Kazaklı-saldatlı 50 minə kimi olardı. Eh... Qərəz, Allah zəmanənin öz sahibini tezliklə yetirsin!!! Elə bircə bu qalmışdı ki, saldatlar məşədi saldat olsun.

Ə - Xaç aşıran günü urus qoşunu şeypur, balaban çala-çala gəlib dörd bəsti çöldən dolanıb bayram günləri olmağına görə şut eləyirdilər, yəqin həzrətə salama gəlmişdilər.

M - Əlbəttə, saldat olanda nə olar, adam kimi dil bilirlər, ziyarətə gələn daşlardan əskik deyillər ki, hələ ki, xudahafiz, rövzənin vaxtı keçir, gedim.

Ə - Xudahafiz iltimasi-dua.

*Qulağilə görən*

## PİŞİKLƏR QIZIB

Bəh, bəh, bəh, Allah bərəkət versin, çoxdan idi qulağımız batmışdı, İrəvanda heç bir səs, səda yox idi. Amma bu gün taq, taq, taq! Ədə, mən dedim bəs bayram olub müsəlmanlar aya güllə atırlar. Qaçdım meydana ki nə? Üçünün cəmdəyi birdən yerdə qalıb. Gördüm bizim əmələyi-mövta çox şad gedir. Soruşdum nə var? Dedi ki: çoxdan idi bazar kəsad idi, ancaq bu gün bir atası rəhmətlik üçünü birdən yıxıb. Allah yaycılı mərsiyəxanın pozulmuş saqqalına baxıb bizə rəhm eləsin. Yeddi arvad almaq da xətadı. Canım, adamın bazar içində abrusu gedir. Bunlar hamısı Xıdır Nəbi bəlasıdır. Pişiklər qızıb müsəlmanlar şərə düşüb. Gedirəm qovut payımı alam.

*İmza: Noxtasız*

### POÇTA QUTUSU

Naxçıvanda "Təzə şairə": Göndərdiyiniz əşarda Şeyx Əli adı olmasaydı çap edərdik.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

ملا نصرالدين

№8 Qiymәti 12 qәpik. МОЛЛА НАСРЕДДИНЪ Цена 12 k. № 8



Litoq. S.Bıxova.

*Müsəlman birjası: hacı, nə var nə yox, bu gün kimin vekseli protestə getdi?*

*Мусульманская биржа*

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində: 12 ay--altı manat.
6 ay.........................................3 manat yarım.
3 ay.........................................2 manat.
Kasıblara.................................12 ay--5 manat.
*6 ay.........................................3 manat.*
3 ay.........................................1manat 60 qəpik.
1 ay.........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay.......................................7 manat.
6 ay.........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакция журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовская ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*21 rəbiüləvvəl 1330* Hər həftə nəşr olunur *27 fevral 1912*

## ƏLACSIZLIQ

Ay müsəlmanlar! Bilmirəm neyləyim, başıma haranın daşını salım. İki aydan artıqdır ki, ağamız Seyid Məhəmməd müctəhid vəfat eləyib, qalmışam səfil-sərgərdan, nə təharətim düzdür, nə qiraətim düz olur, məshi bilmirəm haradan çəkim, dəstəmazı necə alım, əti necə suya çəkim, qüslü nə tövr eləyim, beytül-filanda hansı duanı oxuyub və hansı ayağımı qabaqca atım, lapca mat qalmışam bilmirəm kimə təqlid eləyim, təqlidsiz müsəlman hamıya məlumdur ki, heç zad qayıra bilməz, belə, hətta boğazına çörək yeyib arvadına tuman da ala bilməz. İndi bəs mən nə eləyim, əlacım nədir? Mollalar deyirlər ki, gərək ələm müctəhidə təqlid eləyəsən. Bu lap çətin məsələdir. Müctəhid bir olsa, iki olsa, üç olsa asandır. Amma sən hesab elə gör bu saət Nəcəfdə, Kərbəlada, Məşhəddə, Bağdadda, Kazimeyndə, Təbrizdə, Xoyda, Səlmasda, Tehranda və qeyri müsəlman şəhərlərində doxsan doqquz dənə müctəhidi-camiüddərahim var. Mən yazıq da oxumamış bir adamam, heç başa düşmürəm ki, ələm kəlməsi nəmənədi. Qalsın ki, axtarıb tapmaq. İndi vallah, billah məəttələm kimə təqlid eliyim, noxtamı kimin əlinə verim, ağaların hansına itaət eləyim? Ay müsəlmanlar! Mənə bir yol göstərin! Sizi and verirəm hədsiz-hesabsız cənab müctəhidlərin ictihadına, mən yazığı bu bəladan qurtarıb kimə təqlid eləyəcəyimi nişan verib imanımın kamil olmağına bais olsunlar.

*Noxtasız qalan noxtalı*

## ANA DİLİ

Allah kitab yazanlarımıza uzun-uzunca ömürlər versin. Doğrudan doğrusu belənçi şəxslər çox qənimətdirlər. Əgər bunlar olmasa, Molla dayı, canın üçün millət lap batar. İndi bizi başa saldılar ki, ədəbi dilindən savayı ana dili lazım deyil. Varsa da ədəbi, yoxsa da ədəbi dildir. İndiyə kimi türklər öz loru ana dilində danışıb və yazırdılar, amma indi gərək "ədəbi" dil danışılıb və yazılsın. Bəh, bəh, bəh, bəh. Al gəldi qaraqoyunlu! Bax, Molla dayı, buna nə demişəm, adam gərək elə yaza ki, öz yazdığını özündən savayı heç kəs başa düşməsin. Çünki hamı bu yazıları anlamağa qabiliyyətli olsa, bu cür qabiliyyətli şəxslər aralıqda itib batarlar.

Sən Allah Molla dayı! Ədəbiçilərimizin təzə dili barəsində özgə millətlər içində bir söz açıb danışmayasan, yoxsa o biçarələr də Puşkinin kitablarını yandırıb özünü kafir adlandırarlar və Bakıda tezliklə cəmi ana dilində yazılan kitabları yandırmalıyıq. Sən də pesə-püsəni yığıb başını götürüb qaçasan, çünki sən yazan ana dilində məcmuə ədəbi dilimizin qabağında bir pula dəyməz.

Yaşasın ədəbiyyat! Puç olsun ana dili! Bəlkə onda millət bir az qabağa gedə.

*Dərdmənd*

## HƏQİQİ DOST

Yetim Məmdəlinin İrandan məyus çıxıb getmək xəbərin Uzun dərzi eşidib çox fikir və xəyal eləyir. Belə danışırlar ki, cənab Uzun sərsəm eləyib. Məşhurun bu hala düşməyi şamaxılılara artıq dərəcədə təsir edir. Çünki bu cənab Şamaxıda lağ-lağ danışanların padşahı hesab olunur. Allah bu böyük müsibətin axırını xeyir eləsin. Yoxsa dükanlar qabağın axşamacan gəzib lağ-lağ deyən kimi olacaq. Şamaxılılar üçün də bir dəqiqə lağ-lağ olmasa başları ağrıyar. Çünkü başqa bir məşğələləri yoxdur.

## ƏDƏBİYYAT

*Bərk-bərk qucaqlaşın hamı birdən yatın, yatın*
*Yorğana sarlanın, olun eymən yatın, yatın*
*Bir asqırıb da, gərnəşin hərdən yatın, yatın*
*Xoruldayın görən desin əhsən yatın, yatın.*
*Bəh, bəh bu uyqunun nə gözəl vardı ləzzəti*
*Qalu bəladə çünkü yazıblar bu neməti.*

*Tərpənmə, yoxsa nemətü izzət gedər, gedər*
*Cahü-cəlal, şan ilə şövkət gedər, gedər*
*İzzü-vüqar, qeyrət, himmət gedər, gedər*
*Dursan yəqin ki, izzəti-millət gedər, gedər.*
*Vallah bu yatmağın sənə vardır ləyaqəti*
*Başqa təvayif anlamayıbdır bu hikməti.*

*Elm, ədəb, sənaye, hikmət nədir, nədir?*
*Kəsbü kamal, əql, zəkavət nədir, nədir?*
*Bu ixtira, sənətə qiymət nədir, nədir?*
*Bunlarda bəs fəvaidi-millət nədir, nədir?*
*İğfaldır bular qoyar avarə milləti*
*Lazım nədir çəkək belə bica əziyyəti?*

*Hər kəs qələm alıb dala qaldıq deyir, deyir*
*Bəsdir durun yuxudan usandıq deyir, deyir*
*Karvan köçüb gedibdi yubandıq deyir, deyir*
*Zülm aləmi tutub dəxi yandıq deyir, deyir*
*Varmı bu gunə söz yazanın heç dirayəti?*
*Pək çoxları bu tövr yazırlar şikayəti.*

*Vizrü vəbal boynuma zahid tökər, tökər*
*Təkfir, lən üstümə abid tökər, tökər*
*Cəhani cümlə qətlimə şahid tökər, tökər*
*Tədbiri-məhvimi gecə-gündüz tökər, tökər*
*Vaxtında bircə eyləyək ifa ibadəti*
*Din sahibi gözətləyəcək böylə milləti...*

*Yetim Cücə*

## NAMAZI BATİL EYLƏYƏN ŞEYLƏR ONDUR:

***Birincisi: qandır.***
İkincisi: Eşşəkqulaq kəndinin mollası, molla Sağsağandır.
Üçüncüsü: molla Məşədi Hacı müəllim duanəvis danosyazandır.
Dördüncüsü: Xərabad kəndinin ağsaqqlı iblis hacı Pazqırandır.
Beşincisi: Məşədi Qurumsaqqulu vaiz və mərsiyəxandır.
Altıncısı: Qafqaz və İran meşələrində yaşayan bir sürü heyvandır.
Yeddincisi: Gəncə mahalında genə heyvanlarını bir-birinə qırdıran mülkədar iblis ibn şeytandır.
Səkkizincisi: qubalı Molla Baba, Şamaxıda Şeyx Həmid paşa, Nuxada Şeyx Mahmud, Gəncədə bir xandır.
Mabədi yox da, var da.

*İmza: Qəzvinli*

## GƏRƏK DEYİL

Maşallah, maşallah, Allah bədnəzərdən saxlasın, Molla əmi, belə şəhər olmaz. Deyirlər İrəvan adamları qoçaq deyil, hümmətsizdir. Amma vallah mən insafdan keçə bilmənəm. Bax bu gecə Zayomni bangə qonşu olan evə baca-baca fişəngindən pajar düşmüşdü. Ağzı açılan, dili söz tutan, furqun gəldi başladılar pajarni kamanda gəldi, fayton gəldi dedilər pajarni kamanda gəldi, su boçkası gəldi, dedilər pajarni kamanda gəldi. Qərəz, pişik atıldı pajarni kamanda, uşaq çığırdı, pajarni kamanda. Baba mən bilmirəm pajarni kamanda nəyə deyirlər?

Axır hümmət olan yerdə pajarni kamanda nəyə lazımdır? Mən and bilmirəm, amma inan o bir Allaha ki, az qala bangın rəisləri də çiyinlərinə sənək alıb su daşıyaydılar. Baba hər yerdə hümmət gərək. Müsəlman sənətkarlarını bəyənmirsiniz, görəydin bir o saxsı sənəklər necə iş gördü. İki saat çəkmədi ki, haman pajardan heç bir çınqı da qalmadı, od-mod hamısı söndü qurtardı. Gərək elə nasos olaydı? Pajarni kamanda olaydı?

Sənək olan yerdə nasos gərək deyil. Elə bəzzazların dükan daşıması, bangın qoyub qaçması özünə qaldı. Daha bilmir ki, hər yerdə nasos lazım olmaz. Bizim İrəvanda nə qədər hümmət var, sənək var, kömək dəstəsi lazım deyil. Məsələn, götür çastni məktəblərin mirzələrini, guya birikub hər klasda bir mirzə dərs verəcək. Daha bilmirlər ki, əbcəd olan yerdə ana dili lazım deyil. Daha indiyə kimi ana dili yox idi müsəlman uşaqları oxumaq, yazmaq bilmirdi?

Əgər oxuyub, yazmaq bilmirlər bəs hələ məscidlər dursun, get gör karvansaraların və ...............ların qapılarını lap musurman balası yazıb. İndi məlum oldu ki, oxuyub-yazmaq ana dili ilə deyil! Bəs nə qədər ki, əbcəd var ana dili lazım deyil. Bir də məsələn, nə qədər filan artist burdadı, müsəlmana nə artist və nə teatr gərək deyil. Çünkü o cür dərvişlər cümə axşamları biletsiz də pul yığırlar, bir də hər necə olsa, bir cəmiyyət və bir xeyir iş olsa, mən rəis olmasam, söz mən deyən olmasa o da gərək deyil. Student, intelligent olan yerdə müsəlmanca danışmaq heç gərək deyil, bəy olan yerdə xan gərək deyil, xan olan yerdə də heç kəs, hətta molla da gərək deyil, molla olan yerdə də heç zad gərək deyil, müxtəsər ki, gərək deyil, gərək olsa düzəlməz, indi bil ki, gərək deyil!

*Noxtasız*

## DİNİN RÜKNÜ

Cənab Molla əmi, keçən günlərdə qəzetlərdə məşhur rövzəxan Hacı Molla Əbdüləli barəsində yazılan tərifnamələri oxuyub çox şad oldum. Əz qəza Allahın da biz şamaxılılara mərhəməti keçib. Bu vücudi-mübarəki deyəsən göydən bizim üçün səbət ilə saldı. Bu cənab şəhərimizə varid olan kimi Yuxarı Qala məhəlləsinin camaatı axundu mərsiyə oxumağa dəvət

*Çavuş: düş aşağa, bu at həzrət Abbas malıdır.*





*Bir həftədən sonra Ərəs kənarında satır (İrəvanda)*


باکوده
Въ Баку
Bakıda
عورتی ایله
Съ женой
Övrəti ilə


تفلیسده
Въ Тифлисѣ
Tiflisdə

elədilər. Cənab rövzəpəz xəlayiqi bir qədər feyziyab edəndən sonra başladı köhnə bayatını, yəni qəzetçiləri məzəmmət etməyə ki, guya kafirlər İmam Hüseyn müsibətinə sataşıb deyirlər ki, mərsiyəxanlara verilən pullar əfvahi gedir, axundun buyurmağına görə mərsiyə dinin bir rüknü, güldəstə bəzəmək bir rüknü, baş yarmaq bir rüknüdür. Xülasə, gördüm ki, heç axund buyuran hədislər ilə qəzetlərdə yazılan tərifnamələr bir-birinə müvafiq gəlmir. Ancaq camaata baxıb gördüm ki, axund bunların qaşığın yaxşı tapıb. Afərin olsun sənə belə haziq həkim! Hər kəsin mərəzinə görə davasın verir.

Hə, bunu da yadınızdan çıxartmayın ki, mərsiyə dinin rüknüdür...

*Müxlisiniz: Səfeh şamaxılı*

## ƏCAYİBÜL-MƏXLUQAT

Bəzi qələm sahibləri bu xəyala düşüblər ki, guya biz islam tayifəsinin geridə qalmağına səbəb əlifbamızın çətinliyidir. Uşaqlarımız neçə illər zəhmət çəkib vaxtlarını zaye edirlər, axırda da avara qalırlar. Həta keçən nömrələrdə ədibi-möhtərəm Firidunbəy cənabları da bu mətləbə dair yazmışdı.

Canım! Niyə dağa-daşa düşürsünüz? Nə əlifbamıza təğyir verib kafirlərə müqəllid olaq, nə də belə bimənə sözlər ilə islam aləmini bədnam edib əcnəbilərə rişxənd olaq və nə minlərcə xərc çəkib uşaqlarımızı sair tayfaların uşkollarına və onverstliklərinə göndərək ki, qayıdıb gələndə ata-anası ilə danışmağa ar eləsinlər. Yazıq dövlətlilərin də yaxası kasıb və yetim uşaqların əlindən qurtarsın. Biçara dövlətlilər ianə verməkdən soyuldular. İstəyirsiniz ki, uşaqlarmız hər bir elmə dara olub sair millətlərə ehtiyacları olmasın və Avropa alimlərindən artıq olsunlar, mən bir asan yol tapmışam:

Məndə bir "Əcayibül-məxluqat" kitabı var. Dünyada nə qədər xəyala gəlməyən elm varsa hamısı bu kitabda cəmdir. Afərin bu kitabı yazana, səd afərin! Kişi bimisl bir adam imiş, barmaqları qızıla tutulmalı imiş, bəh, bəh, bəh! A kişi, heç insafdırmı ki, fars demişkən: "Yar dər xaneyi-ma, gerdi-cahan gərdidim".

Belə bimisl kitabı qoyub gedib xaricilərin dalıncan gəzəsən, heyf... səd heyf...

Həmin kitabda başlayıb yerlərdən, göylərdən, aydan, gündən, ulduzlardan, dağlardan, daşlardan, dəryalardan, çaylardan və quyulardan danışmağa. Həmin kitabdan nümunə üçün sizə bir neçə söz söyləyim. Səhifə 117:

"Beyerabi künud çahist be Trablis hər ke əz abi-an biyaşaməd əhməq gərdəd." Qardaşlar! Bu doğruluqda sözə nə deyəcəksiniz? İtalyanlar gedib haman quyudan su içib olublar axmaq, başlayıblar biçarə osmanlıya ki, gərək Trablisi bizə verəsən. Bu yazıq da qalıb məəttəl. İndi baxın belə sözü axmaq adamdan savayı kim danışar?..

Sonra mədəniyyətdən yazır, məsələn neft: "Dər mənabei ab bud növi səfid, növi siyah əz xəvasi-u anəst ki nafe bəvəd ovca məfasil və bəyaz və ab ke beruye didə fürud ayəd əgər nim misqal sahibi-dərdi-şikəm bexorəd şəfa yabəd".

Bax, daha nə incinerə, nə də hikmətə ehtiyacımız yoxdur, neft olar su kənarında və hər vaxt qarnın ağrıdı yarım misqal iç qurtarsın.

Sonra nəbatatdan, ağaclardan və meyvələrdən yazır: "Baqələra bəsyar xordən əqlra befəsad avərəd və nəzər beşükufəəş mövcibi-hüzn və qəm boğəd". Ay canım! Buna da şəkk edəcəksiniz? Bax, iranlılar neçə ildir hüzn-qəmdən kənar olmurlar, çünki ağılları fasid olub, qoy canları çıxsın, niyə bu kitaba baxmıyıblar ki, bu günlərə qalıblar.

Xülasə, hər cür elm desən bu kitabda var, hərdənbir oxuculara məlumat verəcəyəm.

İstəyirsinz gəlin bu kitabı çapa verək, hər kəs bir dənə alıb uşağına oxutsun, uşağı da olsun bir alimi-peyzəvəng.

*Münsif*

## ELAN

Mən ki İrəvan şəhərinin əhli mömin, müqəddəs, pakdamən, iffətli, ismətli, namuslu, qeyrətli, hümmətli və nəcib bir hacı kişi varam. Hər kəsə qərzül-həsən lazım olsa, zəhmət çəkib gəlsə kəmali-məmnuniyyət ilə verərəm. İcarə almaram, çünki ayeyi-şərifə yol vermir, ancaq yüz manat versəm beş yüz manata etibar üçün veksel alaram. Mülki olmayanlar zəhmət çəkməsinlər.

*Adresim: İrəvan, Hacı filan vəkilim, vəkilim: Yetim cücə*

## SİRACÜL-MƏQRUB

Bizlərin rəvayatı səhih olan kitablarından birisi də "Siracül-məqrub" kitabıdır. Doğrudan da bu kitabda elə gözəl və doğru rəvayətlər var ki, lap elə dəli Sadıx da başa düşüb inanır. A kişi, tamamilə peyğəmbərin dilindən rəvayətdir.

Məsələn: orada yazıblar ki: "hamilani-ərş dörd nəfər boynuyoğun məlaikədir, hərəsinin başı on min dəfə İrəvandakı Məmmədəlinin qarnından yekədir. Onların barmaqları yüz min dəfə dərviş çağalasının boynundan yoğundur". Əlbəttə qardaş, gərək belə də olsun. Hərçənd mən ərşi görməmişəm ancaq rəhmətlik nənəm indi deməsin, deyərdi ki, ərş çox-çox yekədir. Əlbəttə elə yekə zadın da gərək o tövr hamilləri olsun. Şəkkakə lənət! Hər kəs inanmasa kafirdir, yəqin kafirdir. Bu kitabı bilmirəm hansı müctəhid yazıbsa Allah onun qəbrini nur ilə doldursun, əsil müsəlman tərəfdarı imiş, doğrudan doğruya biz müsəlmanlara elə bu tövr kitablar lazımdır. Çünki insanın dünyasına da, axirətinə də mənfəəti var. İnşallah Allah qoysa, qismət olsa, Allah əcəldən aman versə, sağlıq olsa, bu kitabın fəzilətindən mömin qardaşlara bir az andırmaq istəyirəm. Hər həftə bir neçə hədis yazacağam, camaat namazının vaxtıdır, özüm də ki mükkəbirəm. Hələ xudahafiz.

*Yetim cücə*

## BAKI MÜXBİRİMİZDƏN TELEFON İLƏ

Şəhər qlasnıları qlava Rayevskinin Bakıdan getməyinə və qlavalıq eləməməyinə artıq dilgir olub, neçə gündür ki, matəmə batıblar. Hər yanda təziyyət teleqrafları alınmaqdadır.

* * *

Buraya yetişən xəbərlərə görə bu yaxınlarda qubalı hacı Molla Baba Qafqaz şəhərlərini gəzib müsəlmanların halından xəbərdar olmaq üçün səyahətə çıxacaqdır. Avropa qəzetləri bu işə artıq diqqət yetirirlər. Bir həftədir ki, qəzetlərin baş məqalələrini bu məsələyə münhəsir ediblər.

*Təzə dəmdəməki.*

## "MOLLA NƏSRƏDDİN" İDARƏSİNƏ

*(Lənət şeytana)*

Molla əmi, Allah şeytana lənət eləsin! Keçən il məhərrəmlikdə bizim Qazax məscidi olmuşdu natarius kontoru. Hər axşam gəlib dolurlardı məscidə şafqalı-şafqalı, nə bilim bu natariusdu, bu matariusdu və başlarlardı ki: "Məsciddə papiros çəkmək olmaz, çay içmək olmaz və ya uşaqlarınızı oxudun, rusca, Allah bilsin yəhudicə". Bu il şükür Allaha məscidə girəndə görürsən minbərin bir tərəfində ağbaşlar, bir tərəfində seyidlər və qabağında da sarıkürk qırmızısaqqallılar və qeyri mömin hacılar. Amma bu il də bir az şeytan dinc durmur. Belə ki, bir gün cənab hacılar minbərin dibində əyləşdikləri halda söhbətləri o qədər uzandı ki, birdən sənin nə haqqın var deyə hacının biri hücum eləyib o birisinin üstünə və az qaldı ki, vurub dişini töksün, ancaq camaat aralığa düşüb sakit elədilər. Genə lənət şeytana!

Bir axşam da bir seyid qalxıb minbərin üstünə pul istədi, bu halda bir ayrı seyid qolunu çırmayıb calandı minbərdəkinin canına nə calandı, bu aralıq camaat hamılıqnan qalxıb ayağa və iki firqə olub başladılar bir-birinə yaman deyib qapazlaşmağa. Polisə gələntək şeytan məscid camaatından əl çəkdi və xalq da dincəldi. Molla əmi! Məscidin belə olmağı şafqalı dolmaqdan əlbəttə yaxşıdır, çünki bu iş şeytan işidir, lənət şeytana! Amma şafqalıların məscidə dolmağı müsəlmançılığı aradan götürür.

*İmza: Qazaq məscidində gözdəkçi*

## XƏBƏRLƏR

İrəvan - Duma qlasnıları qərar qoyublar ki, müsəlman küçələrinin hər iki qədəmdə yanan elektrik fanarlarını artırıb palçıqlarını təmizləyib vadaprovod budkaları da yapdırsınlar. Allah belə qlasnıları papaxdan yuxarı səlamət eləsin.

Axund Kərbəlayı Məşədi Molla Abbas rövzəxan dərviş nurdidəsi and içib Ballı xanımın ocağına ki, bundan sonra minbərdə qəzet oxuyub yazanlara daha lənət eləmiyəcək. Allah mərəzinə şəfa versin.

Tiflis - Müsəlman məhəlləsində tikilən təzə teatroya Tiflis tacirləri və əyanları o qədər ianə verirlər ki, alıb qəbz verməyə macal yoxdur.

## POÇTA QUTUSU

Gəncədə "Beşaçılan"a: Şerləri nəm yerdə saxlamısan kifsiyiblər.

Bakıda "Bir cavan"a: Yazdıqlarını zarafat hesab eləsək genə sənin məsləhətindir.

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*




*Qəzvində vaiz hacı müctəhid: xudavəndi aləm özü buyurubdur "əbəd", yəni hər müsəlmana vacibdir öz ağasını görəndə ikiqat olsun.*

1 Rəbiülaxər 1330 **Yeddinci il** 8 марта 1912 г.

# ملانصرالدین

**№9 Qiyməti 12 qəpik.** МОЛЛА НАСРЕДДИНЪ **Цена 12 k. № 9**




Litoq. S.Bıxova.

*Balam, yavaş-yavaş yeriyin ki, borc sahibləri görməsinlər, yoxsa yapışarlar yaxamızdan, ötürməzlər.*

**ABUNƏ QİYMƏTİ**

Qafqazda və Rusiya daxilində: 12 ay--altı manat.
6 ay..........................................3 manat yarım.
3 ay..........................................2 manat.
Kasıblara.................................12 ay--5 manat.
*6 ay..........................................3 manat.*
3 ay..........................................1manat 60 qəpik.
1 ay..........................................40 qəpik.
Əcnəbi məmləkətlərə
12 ay........................................7 manat.
6 ay..........................................4 manat.
Nüsxəsi idarəmizdə..................10 qəpik.
özgə şəhərlərdə........................12 qəpik.

Məcmuənin adresi:

*Tiflis, "Molla Nəsrəddin" idarəsi. г.Тифлисъ*

Редакчийа журнала "Молла Насреддинъ".
Açıq türk dilində yazılmıyan məktub və məqalələr çap olunmur, adres dəyişmək haqqı 3 dənə 7 qəpiklik markadır.

*Şəhərdə adresimiz:*
***Davidovski küçədə, 24 nömrəli evdə.***
***Тифлисъ, Давыдовскайа ул. д.№24***

Bunu da lazım bilirik xəbər verək ki, təzə qərardada görə bundan sonra Rusiyanın hər bir poçtaxanasında məcmuəmizə abunə qəbul olunur.

*1 rəbiülaxər 1330* *Hər həftə nəşr olunur* *8 mart 1912*


## ARTİSTLƏR

Dünən vağzalda bir cavan oğlan, əlində çamadan, sol əlində paltosu, adamların dal tərəfindən gizlincə istəyirdi ki, çıxsın platformaya. Ona oxşuyurdu ki, Tiflisdə mehmanxanaya borclu qalıb xəlvətcə əkilir ki, borc sahibi bilməsin.

*Maşın fişqırıxladı, çıxdı getdi.*
*Ya yalan ola, ya doğru - pənah Allaha.*

Tiflisdə mənim hansı qostinsaya yolum düşür - qostin sahibi başlayır bizim müsəlman artistlərini xəbər almağa.

Məlum olur ki, çoxları borclu qalıb xəlvətcə qaçıblar.

Evdə oturursan, zəng çalınır. Kimdir, bir kasıb qoca gürcü arvadıdır, hə nə deyir, deyir ki, filan müsəlman artisti haradadır? Deyirsən ki, məsələn: Naxçıvandadır, yainki Bakıdadır.

Məlum olur ki, müsəlman qardaşlar bu yazıq arvadın evini kirayə ediblər və nəinki məhz ev kirayəsini götürüb qaçıblar, bəlkə bu yazıq övrətin kürkünü aldadıb alıb aparıblar ki, yolda üşüməsinlər.

Axırda elə olubdur ki, Tiflisdə iki baqqal haq-hesab üstə sözə gələndə, birisi o biri bədhəq yoldaşına deyir:

– Axırda sən də mənə müsəlman artisti oldun…

Mən əvvəllər səhv başa düşərdim: elə bilərdim ki, müsəlman artisti ibarətdir elə bir şəxsdən ki, səhnəyə çıxıb avam müsəlman qardaşa ibrətli sözlər deyə.

İndi belə məlum olur ki, artistin bir mənası da var imiş:

Yalançı, xalqın malını özünə halal bilən, yoldaşın haqqını kəsən və həmişə özgələrə hiylə qurub yalan ilə başını saxlıyan.

Amma bir para belə juliklər çıxanda, söz yox, doğru və dürüst, həqiqi artistlərimiz də yox deyil.

Bunlara da salam olsun Molla Nəsrəddin tərəfindən.

*Molla Nəsrəddin*

## MƏİŞƏTİMİZƏ DAİR

*Çal qara zurna dəfini çal, Poqos,*
*Məclisə zurna səsini sal, Poqos*

*Kəspər ağa, açgilə vodkaları*
*Sən elə sirab bu motkaları*
*Məclisi-eyşə gətirin dilbəri*
*Tans vura ol yanağı əhməri*

*Çal qara zurna dəfini çal, Poqos*
*Onluğunu, beşliyini al, Poqos.*

*Boşla məni ay kişi millət nədir?*
*Ar nədir, ibrət nədir, qeyrət nədir?*
*Fənn nədir, elmlə sənət nədir?*
*Acdı tatarlar belə söhbət nədir?*

*Çal qara zurna dəfini çal, Poqos*
*Dinməz oturma belə sən lal, Poqos.*

*Rumkaya qurban ola nənəm, dədəm*
*"Prinesi iskoro" aman dəmbədəm*
*Şimdi gərək başqa səxa göstərəm*
*Ta dağıdam bu gecəni lacərəm*

*Çal qara zurna dəfini çal, Poqos*
*Sübhə kimi burdaca sən qal, Poqos.*

*Boşla nə millət, bu nə irz, nə ar*
*Sən belə söhbətləri eylə kənar*
*Başlıyalım şimdi də bəzmi-qumar*
*Ay gədə nərdi ilə asnar biyar*

*Çal qara zurna dəfini çal, Poqos,*
*Əlliliyi ciblərinə sal, Poqos.*

*Əz-tərəfi oxuyub qurtarmışlarımız*
*Nazimi: Mirzə Qoşunəli*

## MƏSLƏHƏT

Ay Molla əmi! Sənə bir məsləhət eləyəcəyəm: səni and verirəm Məşə Gülməmməd əminin S bəyə yadigar qalan cin kitabına doğru deyəsən ki, mən bu işdə lap iki könüllü qalmışam. Çün bizim bu Uluxanlı kəndində iki ildi bir təzə məktəb bina olunub, heç mənim xoşuma gəlmir, çünki Allah keçənlərinə rəhmət eləsin rəhmətlik mənim dədəm məni uşaq vaxtında məçidə qoydu, əgərçi bir həftə oxuyandan sonra bir noğat, iki noğat oxuyanda molla dedi degilən cəzim, mən ancaq dedim cecim. Molla məni oxarta əzdi ki, ölənə kimi. Axırı mollaya iki min yaman dedim, özüm də məktəbdən qaçdım. Amma o vaxt üç ay məndən qabaq məktəbə gələn uşaqlara baxırdım ki, məndən çox oxumuşdular və belə oxuyurdular: "Əlif zəbərə bey zən əb cim zəbərcə dal zən cəd əbcəd". Amma indi bu təzə məktəbdə heç uşağa Quran zad görsətmillər, elə başlayırlar ayı gəldi, qurt getdi. Bir də Mirzə Cəfər adlı müəllim var, lap uşağa elə babı dərsi verir. İki ildi bu uşaqları oxudub lap xanə-xərab eləyib. Hələ hamısından pis budur ki, kəndimizin alimi hacı axund... adını alim qoyub o cür müəllimləri götürüb çörək verib saxlayır. A kişi, sən axund adamsan, sənə nə yaraşır bu cür - bu cür xilafişər' işlər? Sən də bax o biri axundlara otur yerində, niyə xalqın uşağına şüğli zimmə olursan. Hələ bu beş on günlərdə də nə bilim deyillər hacı axund İrəvan qubernatından izin alıb uşaqları tamam aparıblar uçkolanın bir otağında oxudullar, hələ ona da razı olmullar, gündə bir saat da uçitel Şəməddinbəy gəlir o uşaqlara urus dərsi nə bilim nəmənə örgədir. Babı olmaqdan əlavə bu yazıq musurmanların uşağını urus da eləyəcəklər, indi əlacım bir ona qalıb ki, sənə məsləhət eyləyirəm, görüm sən nə fitva verirsən: mən istəyirəm bu Uluxanlının tamam qırmızısaqqal möminlərini yığam başıma, bir dəfə va şəriəta deyib tökülək Mirzə Cəfəri bu kənddən çıxardıb qovalıyaq və məktəbin taxta-tuxtasına od vurub yandıraq ki, kəndin bərəkəti qaçmasın...

*Kəblə müftəxor*

## ÖSKÜRƏK PİRİ

Pir özü dünyada mövcud olan müqəddəs məkanlardan birisidir. Bu pirlər həmişə pakizə, əsil musurman və imanlı şəxslərin tərəfindən icad olunur. Əlbəttə, inanmasaq kafir oluruq. Bizim bu köhnə Nuxa şəhərində təzə, köhnə pirlər hərçənd çoxdu, ancaq indi hamısından artıq öskürək piridir. Hər kəs gecə öskürsə sabah tezdən durub bir kirvəngə qartop şamı alıb aparsın orada yandırsın, əlüstü şəfa tapsın. Bu piri-möhtərəmin bir kəraməti də budur ki, nə bərk külək olsa orada yanan şamı keçirmir. İndi müsəlman qardaşları xəbərdar edirik ki, hər kəs öskürsə bu pirə müraciət etsin, inşallah şəfa tapar.

*Adres: Nuxa qəbiristanlığı, öskürək piri.*

*Pirverdi*

## HƏKİM

Cənab Molla əmi! Sən olasan Mozalanbəyin canı hərçənd uzun mətləb olsa da bu əhvalatı məcmuənizdə çap edəsiniz. Bir neçə gün bundan qabaq bizim Qələciqdə bir kişi naxoşlayır. Buna əlacdan ötrü Vəndam həkimini gətirdik ki, əlac eləsin. Bu həkim bizim Qəbələ çastında çox yaxşı mahir həkimdir, hələ bir atı da var ki, bir qıçı çolax, gözünün biri də kor kimidir, bu da ayıb deyil, çünki çox kasıb və fəqir adamdır, yaxşı at ala bilmir, bir az da paltarı cındırdır, özü də bir balaca naxoşhaldır, azarlının yanına gedəndə yolda soyuq olmasın deyə qulaqlarına pambıq tıxıyır. Bəli, bu həkim lap yaxşı həkimdir ha. Və yaxşı dərmanları da var, Cüvəllağıbəyin başı üçün mən öz gözüm ilə görmüşəm, hər bir dərmanı var. Elə ki, azarlıya baxır, deyir ki, buna kök qoyun dərisi lazımdır. O saat bir qoyun kəsdirib azarlını dəriyə çəkir, amma biçarə azarlı dərinin içində partlayıb susuyur, deyir ki: "Həkimbaşı! Aman ölürəm! Su! Yandım!" Həkim deyir ki: "Sarsaqlama, su nədi, hələ dayan!" Bu azarlının yanında bir para qazet-mazet oxuyan axmaqlar var idi, olar deyirlər ki: "Ay rəhmətliyin oğlanları! Bu həkimliyi və dava dərmanı nə bilir, əgər bu həkim olsaydı qabaqca öz vücuduna əlac edərdi ki, hər qulağında bir çətvər pambıq olmazdı, tez olun, Qutqaşından bir urus həkimi gətirin". Bir para axmaqlar da onların sözü ilə gedib Qutqaşından bir dinsiz felşili gətirirlər. A kişi nə deyim, bu kafir felşildə zurna kimi bir şey var idi, onu azarlının qarnına və döşünə qoyub qulaq verib deyir ki: "Bu zatülcəmdir." Sonra üzünü həkimə tutub deyir ki: "Ay canım, bunu nə üçün dəriyə çəkirsən? Dəri nə lazımdır? Buna bir şüşə sirkə, bir az da buz lazımdır, bularnan ovxala, mən də tez aptekdən dərmanlar göndərəcəyəm, oları da içsin, tez yaxşı olar".

Bizim fağır müsəlman həkimi də dinsiz felşelin qorxusundan bir bucağa qısılıb əsə-əsə gözlərini döyür.

Felşel gedib dərmanları göndərir, azarlı da yaxşı oldu. İndi biz deyirik ki, azarlını müsəlman həkim qurtardı, amma bəzi axmaq oxumuşlar deyirlər ki, felşel qurtardı. Bu saat bizim aramızda bərk höccət var, siz də dünyagörmüş bir kişisiz, həqiranə təvəqqə edirik ki, hansımızın sözü haqdırsa yazasınız.

***Möhübbəküm Keçəlov***




*Bakı quberniyasında Türkan kəndində təzə üsul ilə açılan məktəbin şeyləri.*



*Qubada hacı Molla Babanın Molla Ruhullaha təziyə saxlamağı.*

## MƏNZUMƏ XƏBƏR

*Molla əmi! Yetdi genə novbahar*
*Ərz eləyim şimdi sənə hər nə var:*

Çün yetişib indi Əli bayramı
Xırda böyük cəmdi buraya hamı
Görmək olurmu belə bir bayramı?
Həm Əli bayramıdı həm də bahar.

İndi düzəlmiş hamı iş kargaha
Gəl İrəvana gör özün bir daha
Eylə nəzər burdakı cövlangaha
Zorba cavanlar necə gör at çapar.

Bir nəzər et bu Məmili axmağa
Atlanır ortaya güləş tutmağa
Səy eləyir bir-birini yıxmağa
Bir də müqabil ona bir gürcü var.

Xəlq tamaşaya yığılmış bura
Cümləsi diqqətlə baxırlar ora
Bu o birin tolladı burdan ora
Qol qırılıb, baş yarılıb qan axar.

Onda ucaldar hamı birdən səsin
Ay barəkəllah Məmili afərin
Yıxmayacaqdır səni heç kəs yəqin
O əl-ayaq o yekəlik səndə var.

*Şərr xəta*

## TİCARƏT

Əzizim Molla əmi! Nə bixəbər Tiflisdə Davidovski küçədə bir küncdə yatmısan. Nə səbəbə bu neçə ilin müddətində əqəllən bir dəfə bizim şəhərimizə gəlib bizləri sərəfraz etmək istəmirsən? Hərgah camaatımızın içində olan nifaq cənabınızı rəncidəxatir edibdir, qorxma, arxayın ol, haman nifaq ki, siz görmüşdünüz, indi ittifaqə mübəddəl olubdur. Şəhərimiz sən görən şəhər deyil, indi lap dəyişilibdir. Güman edirəm ki, hərgah gəlib Naxçıvanı görsəniz yəqin ki, Tiflisdə bir saat qalmazsınız. Siz Naxçıvanda olan vaxtlar camaatımız çox artıq kasıb idi. Yavan çörək tapmaq bunlara məhali-mümtəne idi, amma indi Allah bəzi millətpərəst tacirlərimizə ömri-tulani əta buyursun. Onların dövlətindən işlər çox yaxşı keçir. Şəhərimizin övzaı mən deyə billəm ki, Bakının övzaından da artıqdır. Yazıq Molla əmi. Sən bizim şəhərdə olan zamanlarda qumarxana dükanları və meyxanələr təmamən bağlı idilər, heç bunlara gedən yox idi. Çünki o vaxt camaatımız kasıb düşüb pula həsrət idi. Amma indi... genə də indi... şəhərimiz, camaatımız bilmərrə dəyişilibdir... Məsələn: götür saman meydanında oturan bir tay samana göz dikən qardaşlarımızı, bunlar indi hərəsi bir bəzzaz dükanının sahibi olublar, dəmirçixanada olan pencər və qatıqsatan baqqallarımız indi yekə abarot sahibi olub Maskov və Nijni ilə alış-veriş edirlər. Qumarbaz əfəndilərimiz böyük tacir olublar. Meyxanalar küncündə həmişə bir şahı araq pulunun məəttəli qalan altmış yaşında olan bəyimiz indi şəhər bulvarında meyxana sahibi olubdur və o bəyimizin camaatımıza mənfəəti hamıdan artıqdır. Bu cəhətə ki, zalım oğlu erməni meyxanaçılarının əlini təxtəyə bağlayıbdır. Həmişə erməni meyxanaçılarından çaxırı butulkada bir şahı əskiyinə satır və müsəlman qardaşlarımız da ittifaq etmək üçün erməni meyxanalarından bilmərrə yığışıb mənfəəti öz müsəlman qardaşlarımıza verirlər. Molla əmi! İndi sən mənim bu yazdıqlarımı oxuyub fikir edəcəksən necə ola bilər ki, bir az zamanda Naxçıvanın övzaı dəyişilib belə tərəqqi tapa. Söz yox ki, inanmayacaqsan və dübarə məndən sual edəcəksən ki, nə bais oldu? Mən də isə sənin sualına belə cavab verəcəyəm: bank taciri: ... (obşestvo vzaimnoqo kredita) hansının ki, güşad olunmaqlığı fövqdə yazdığım şəxslərin çörək sahibi olmaqlarına bais oldu, Allah bu bank fikrinə düşən və bunun binasını qoyan ərbabi-sərvətlərimizə cəzayi-xeyir versin. Bankın bərəkətindən şəhərimizdə bir kasıb adam tapılmaz, tapılsa da şapkalı çinovniklərimiz və uçitellərimizdirlər. Hansılar ki, acı papirosdan savayı bir şey ələ gətirməklikdə acizdirlər.

Hə, yadıma düşdü: bir də məktəbimiz kasıbdır, nə iskamı var, nə daska var, nə müəllim var və nə də mütəəllim... Toyuq hininə bənzər bir balkondur məscidin yanında, nə rəis var və nə də komissiya. Doğrudur məktəb bir il bundan qabaq çox yaxşı yeriyirdi, bu səbəbə ki, bank yox idi, komissiya da yaxşı baxırdı. Amma o zamandan ki, bank binası şəhərimizdə qoyuldu məktəb də yaddan çıxdı, komissiya da getdi işinin dalınca. Çünki həmi məktəbə, həmi banka nəzarət yetirmək komissiya əzalarına çox zəhmət yetirirdi.

Ona cəhət biçarələr məktəbdən əl çəkib banga çilen olub oranın tərəqqi tapmaqlığına müqəyyəd oldular. Həqiqət, bangın genə camaatımıza mənfəəti var, məktəbin nə mənfəəti olacaq? Məktəbi oxuyub qurtaran şagirdlər axırda laməzhəb olub, məzhəbə sataşıb, mollalar barəsində həcv yazıb, şəriətə xələl yetirəcəklər. Amma bangdan mənfəət görən ərbablarımız bangın müftə onluqlarını minbər ayağında rövzəpəz əfəndilərimizə verib hamımızı guppultu ilə behiştə tökəcəklər. Xülasə, Molla əmi! Fürsəti qənimət bil, gəl Naxçıvana bəlkə bir dövlət sahibi olasan. Yoxsa bifayda jurnal satmaqdan axırın bir yerə çatmayıb Şeyx Sənan qəbiristanında dəfn olunacaqsan və üstündə molla da tapılmayacaqdır ki, namaz qılıb təlqin versin, bəlkə bağışlanasan.

*Şirxan bəy*

## NAXÇIVANDAN

Bu gün martın ikisində şəhərimizin mərsiyəxanlarından birisi evində bir neçə müəmməm mollalar ilə cəm olub, çay içib söhbət eləyirdik. İttifaqən şəhərimizin ən mötəbər zakirlərindən birisi Mir Pırtdaşıq otağa daxil olub müztərib halda üzün mollalara tutub söylədi: "Əfəndilərim! Bu keçən gecə şəhərimizin hacılarından bir nəfəri bəndə üçün bir yaxşı yuxu görmüş. Yuxunun təfsili budur ki: Guya mən Ümmi Külsüm əleyhəsəlamı təzvic etmişəm və Əmirəlmöminin əfəndimiz mənə bir əba və bir heybə bağışlamış. İndi təvəqqe edirəm ki, hacının mənim barəmdə gördüyü yuxunu təbir edəsiniz".

Məclisdə hazır olanlardan heç birisi bu yuxunun təbiri gələcəkdə nə olacağın təqrirə gətirmədi... Çünki necə ki, cənabınıza da məlumdur yuxu təbir eləmək çox böyük elmdir.

Təvəqqə edirəm yuxarıda yazılan yuxunun təbiri nə olacağını möhtərəm jurnalımız vasitəsilə xəbər verəsiniz. Çünkü cənabınızdan savayı heç bir kəs bu yuxunun təbirini söyləməyi ixtiyar edə bilməz. Ümidvaram bu xahişimi qəbul etməklə hər iki tərəfi razı qoyub eydinovruzu biz Naxçıvan camaatı üçün mübarək qılasınız, əks surətdə bəd keçəcəkdir.

*Müxlisiniz: Pəri*

## HALAL PUL

Dünyada halal pul da çoxdur, haram pul da. Amma bizim Məşqətə kəndində deyəsən bir köpik haram pul tapılmaz, amma halal pul çoxdur. Axır başıvı nə ağrıdım, Molla əmi, hər kəsin özü üçün sənəti var, pul qazanıb başını dolandırır.

Bir də görürsən Molla əmi, 44 nəfər qeyrətli cavanlar (bunların qeyrətinə qurban olum) həmqəsəm oldular ki: "Biz gedək həzrət zillüllah şahənşahi-İran Məmdəlinin köməyinə, onun yolunda şəhid olaq."

A kişi! Belə də iş olar? Bu kafir əncümənlər zillüllahı təxtdən salıblar ki, biz məşrutə istəyirik, cəhaddır, gəlin gedək ki, qiyamət günü həzrət zillüllahla məşhur olaq".

Qərəz, nə başıvı ağrıdım, Molla əmi, bular gedirlər Məmdəlinin yanına, bunlara çox hörmət eləyir, tapança və tüfəng, patron verir, bunlar olurlar müsəlləh, gedirlər dava eləyirlər. Bir vaxt görürlər ki, hər birinin beş min, on min pulu var. Çıxıb gəlirlər kəndə. Gör heç belə halal pul olar. Kişilər zəhmət çəkib güllə qabağına gediblər, bax "Camei-Abbas" kitabının cihad fəqərəsinə.

Molla əmi! Gələn məktubda bunların adlarını yazmaq borcum olsun.

*İmza: Yetim Xorus*

*15 mahi-fevral, Şəhri-Qəzvin*

## MƏKTUB

Birinci şəkil: erməni balaları müəllimlərilə bahəm oxumağa gedirlər, amma biçarə müsəlman balaları 5 yaşından 10 yaşına kimi telli birçəyi mütrüb babasından yaxşı əməllər və tərbiyəyə dair gözəl sözlər əxz edirlər.

2) Erməni müəllimi balaca uşaqlara gimnastika dərsi verir. Müsəlman balaları da barmaqlarda çəng, bellərdə kəmərçin, içlərində kosagəlin bəzəyi: başda uzun keçə papaq, ucunda zınqırov, üzündə keçə niqab, uzun saqqal, beldə kəndir, ayaqyalın, tuman dizə kimi çırmanmış, çırtmıq vurub oynayır.

İki qaval, bir dünbəy, iki kamançaçalan mütrüb babasından uşaqlar bazigərlik dərsi alırlar.

3) Məclisi-eyşdir. İran: Qonaqlar dörd tərəfdə əyləşiblər. Qoca hacılar, seyidlər və xanlar, balaca uşaqlar ortalıqda, mütrüblər və kosa gəlin oynamağa məşğuldurlar. Qonaqlara çay, qəlyan və papiros gətirirlər. Amma hamıdan artıq qonaqların mütrübün rus libasında oynamağı xoşlarına gəlir.

4) Erməni camaatı tüccar malından puta bir qəpik almağa qərar qoyub bu pul ilə bir ali məktəb bina etdilər. Amma mollalar tacirləri məzəmmət edib deyirlər: "Ağalar! Nə üçün hümmət etmirsiniz, bu kişi ziyarətə gedir, pulu kəsirdir, savaba daxil olun, pul verin, bu yazıq ziyarətdən məhrum olmasın!"

*Müdir və baş mühərrir: Cəlil Məmmədquluzadə*

## ELANLAR



*Ay kirvə, Allah rizasına, bu qabları girov götür, mənə bir az pul ver, balalarım acından həlak oldular, ərim ziyarətə gedib.*